*Mən Aşığam, düşə nəm,*
*Atlanuban düşənəm.*
*Nə sən gözdən salansan,*
*Nə mən gözdən düşənəm.*
**Sarı Aşıq**



**№4(15)**
**2014**

**Bakı-2014**

**Laçın yurdu, №4(15), 2014**
**Bakı, "Bəxtiyar-4", 2014. – 96 səh.**



Hüquqi ünvan:
**Mərdanov qardaşları 98**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

**HÖRMƏTLİ OXUCULAR!**

**“Hər kənddən, hər məktəbdən 1 abunəçimiz olsun, hər kəs 1 jurnal alsın!”** kampaniyası davam edir. Bu kampaniyaya qoşulanlara bəri başdan öz təşəkkürümüzü bildiririk.

Xatırladaq ki, jurnalımızı “Azərmətbuatyayımı”nın Sumqayıt, Gəncə, Mingəçevir, Bərdə, Ağcabədi, Yevlax, Qax və Şəki şəhərlərindəki köşklərindən almaq olar.

**Əziz oxucular,** jurnalımız hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır, **illik abunə qiyməti 8 manatdır.** İnşallah, növbəti sayımız **2015-ci ilin mart ayında** işıq üzü görəcək.

# LAÇINLILAR ULU ÖNDƏR HEYDƏR ƏLİYEVİN ƏZİZ XATİRƏSİNİ EHTİRAMLA YAD ETMİŞLƏR

12 dekabr 2014-cü il tarixdə Azərbaycan xalqının unudulmaz oğlu, ümummilli lider Heydər Əliyevin əziz xatirəsinin yad edilməsi ilə əlaqədar Laçın Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə rayon sakinlərinin daha sıx məskunlaşdıqları Ağcabədi rayonunun Taxtakörpü qəsəbəsində geniş anım mərasimi keçirilmişdir. Çoxsaylı rayon ictimaiyyəti nümayəndələri, qəsəbə sakinləri və məktəblilər ümummilli liderimiz Heydər Əliyevin Laçın Rayon İcra Hakimiyyətinin inzibati binası qarşısındakı büstü önünə toplaşaraq ulu öndərin əziz xatirəsini yad etmişlər. Büstün önünə Rayon İcra Hakimiyyəti adından əklil qoyulmuş, rayon sakinləri tərəfindən qərənfillər düzülmüşdür.

Sonra mərasim Rayon İcra Hakimiyyətinin inzibati binasının iclas zalında davam etdirilmişdir. Ulu öndər Heydər Əliyevin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad olunması ilə başlayan mərasimdə Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov çıxış edərək Heydər Əliyevin dünya siyasətçiləri arasındakı xüsusi mövqeyindən, xalqımız qarşısındakı misilsiz xidmətlərindən söz açmış, müasir Azərbaycan dövlətinin Heydər Əliyevin əvəzedilməz strategiyası sayəsində bu gün də möhtərəm prezidentimiz cənab İlham Əliyevin rəhbərliyi altında yeni uğurlara imza atdığını, dünyada öz layiqli yerini tutduğunu xüsusi vurğulamışdır.

Mərasimdə çıxış edən rayon ağsaqqalları ulu öndər Heydər Əliyevin zəngin həyat və fəaliyyətinin müxtəlif dövrlərinə bir daha nəzər salmış, onun möhkəm iradəyə, mahir diplomatiya və idarəçilik qabiliyyətinə, geniş zəkaya, yüksək insanpərvərlik xüsusiyyətlərinə malik olmasından ətraflı danışaraq əziz xatirəsi önündə baş əydiklərini bildirmişlər. Eyni zamanda onlar istər Sovetlər İttifaqında, istərsə də müstəqillik illərinin ilk dövründə Heydər Əliyevin respublikamızda qazanılmış uğurların başlıca təşkilatçısı və səbəbkarı olduğunu xatırlatmış, ulu öndərin əziz xatirəsinin tərəqqipərvər bəşəriyyətin yaddaşında əbədi yaşayacağını, hələ xalqımıza onun layiqli davamçısı, ölkə prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə daha möhtəşəm qələbələr gətiriləcəyini bildirmişlər. Həmçinin qəti əminliklə vurğulanmışdır ki, ölkəmizin yeganə problemi olan Dağlıq Qarabağ məsələsi, yağı düşmən tərəfindən işğal olunmuş tarixi torpaqlarımız ölkə Prezidentinin apardığı qətiyyətli və dönməz siyasət sayəsində tezliklə işğaldan azad ediləcək, respublikamızın ərazi bütövlüyü təmin edilməklə bütün köçkünlər öz ata-baba yurdlarına dönəcəklər.

Mərasimdə ulu öndər Heydər Əliyevin ruhuna Quran ayələri oxunmuş, Allahdan rəhmət dilənmişdir. Anım mərasimi rayon sakinlərinin Heydər

Əliyevə daimi sevgi və ehtiramlarının olduğunu, həmçinin ümummilli lider Heydər Əliyevin əziz xatirəsinin xalqımızın qəlbində əbədi yaşadığını və əvəzolunmaz ideyalarının dövlətimizin inkişafı və tərəqqisi yolunda əbədi mayaka çevrildiyini bir daha göstərmişdir.

## O KƏND BİZİM KƏNDİMİZDİ

### SONASAR KƏNDİ

**Tarixi və mədəniyyəti:** 1992-ci ilin may ayından erməni terrorçuları tərəfindən işğal olunub. 1992-ci ilin iyun ayından Azərbaycanımızın vətən-pərvər oğlanları və Laçın rayonundan olan könüllü döyüşçülərin hesabına yenidən azad edildi. Oktyabr 1992-ci ildə Sonasardan 6 km Laçın dəhlizinə doğru, vacib strateji yüksəklik olan Hoçaz qayası da daxil olmaqla ərazi artıq Azərbaycan Ordusunun nəzarətində idi və kənd əhalisi kəndə qayıt-mağa hazırlaşırdı. Baxmayaraq ki, evlər və digər tikinti obyektləri ermənilər tərəfindən dağıdılmışdı, kənd əhalisi "elnən gələn qara gün toy-bayramdır, alaçıq qurub torpağımızda yaşayarıq" deyirdilər. Hətta bir neçə ailə tezliklə geri qayıdıb, öz evini yenidən qurmağa çalışırdı ki, bu istək uzun sürmədi. Komandir könüllü döyüşçüləri yığıb, Laçını boşaltmaq əmri verdi və yuxa-



***Şəkildə görünən binalar kəndin inzibati binası və uşaq bağçası idi. Fotoşəkil 2012-ci ildə çəkilib.***

rının göstərişinin olduğunu bildirdi. Döyüşçülərlə komandir arasında silahlı münaqişə olsa da belə, “yuxarının göstərişi” deyib bizləri bir daha azad etdiyimiz ata-baba torpaqlarımızdan uzaqlaşdırdılar.

Sonasar kəndinin tarixi çox qədim dövrlərə təsadüf edir. Belə ki, bunu kənd ərazisində olan qədim kahalar, qədim körpülər, tapılan qədim ev əşyaları, küpələr, eramızdan əvvəl VI-I əsrə aid mağaralar, üzərində müxtəlif işarələr və yazılar olan böyük daşlar, Qətər aşırımında olan "Dev damları" adlanan nəhəng daşlarla örtülmüş qədim kurqan tipli (dərinliyi 4 metrədək) çoxmərtəbəli qəbirlərin və Alban mədəniyyətinin nümunəsi olan kilsənin olması sübut edirdi.



Kənd ərazisindəki qədim meyvə bağları da, bu kəndin yaşayış tarixinin eramızdan əvvəlki dövrlərə təsadüf etdiyinə dəlalət edirdi. Ermənilərin işğal etdikləri Azərbaycan torpaqlarında özbaşına arxeoloji qazıntılar aparmaları və qədim tariximizə aid tapıntıları öz adlarına çıxmaları, Sonasardan da yan keçməyib. Eramızdan əvvəl VI-I əsrlərə aid xəzinə (dağıdılmış Alban kilsəsinin ərazisində tapılıb) Sonasar kəndində məskunlaşan erməni çoban tərəfindən aşkar edilib. Çoban qızıl, gümüş və bürünc metallardan düzəldilmiş bəzək əşyalarından ibarət xəzinəni İrəvan Tarix Muzeyinə təqdim edib (şəkillərə bax).



İrəvanlı ekspertlərin ilkin qiymətləndirmələrinə görə, qızıl-zinət əşyalarının dəyəri 30 milyon (30000000) avrodan bir qədər çoxdur. YUNESKO-nun mədəniyyət sərvətlərinin qaytarılması barədə beynəlxalq konvensiyaların tələblərinə uyğun olaraq qızıl-zinət əşyaları ölkəmizə geri verilməlidir. Hazırda Laçın Tarix və Diyarşünaslıq Muzeyinin işçiləri dağıdılmış və oğurlanmış tariximizlə bağlı beynəlxalq instansiyalara haqlı tələblərini irəli sürməkdə davam edirlər.

İşğaldan əvvəl kəndin əhalisini əsasən türk mənşəli Təhməzli tayfası təşkil edir ki, onların da bu kəndə ilk gəlişləri XIV əsrə təsadüf edir. Qızılbaşlardan olan Təhməzlilər qədim türk tayfaları olub, Quzey-Doğu Ana-

doludan (indiki Ərzurum, Van ətrafı) bu ərazilərə köçmüşlər. Qeyd etmək lazımdır ki, 1380-1385-ci illərdə Sonasar kəndinə köçən Təhməzlilər o dövrü belə (ulu babalarımızdan bizlərə gəlib çatan şifahi məlumatlara əsasən) söyləyirlər: Sonasarda 1000 illər əvvəlcədən məskunlaşmış yerli türk tayfaları yaşayır və əkinçiliklə məşğul olurdular. Təhməzli tayfası, onlara məxsus qoyun, keçi, iribuynuzlu qaramal, at ilxısı və onların heyvan sürülərini qoruyan cins çoban itlərini də özləri ilə bu əraziyə gətirmişdir. Məhz heyvandarlığın inkişafı da Sonasar və ona yaxın ərazilərdə bu dönəmdən sonra başlayır. Cins atları və mükəmməl silahları ilə yerli türklərdən fərqlənən, sarışın, mavigözlü, ucaboylu, qorxmaz, cəsur, qüvvətli və tədbirli olan Təhməzlilər ərazini gəzib dolandıqdan sonra, Hoçaz və Sonasar kəndlərində daimi məskunlaşmaq qərarına gəlmişdir. Qeyd edim ki, Mayıs və Mişni kəndlərində yaşayan Gəloxçular tayfasının da Quzey-Doğu Anadoludan bu əraziyə gəlişləri bu dövrə təsadüf edir. Onların Təhməzli tayfası ilə qonşuluq tarixinin 2000 ildən artıq olduğu güman edilir. Təhməzlilərin islam dininin şiəlik (Cəfərilər) təriqətinə qulluq etməsi və qısa müddət ərzində bölgədə geniş nüfuza malik olması, islam dininin Sonasar və ona yaxın ərazilərdə yayılmasına da xidmət etmişdir. Laçının Seyidlər kəndindən olan Seyidlərin Təhməzlilərin bu xidmətlərinə görə onlara böyük və xüsusi hörməti vardır. Tarix boyu Təhməzlilər dövlətçiliyə, milli-mənəvi dəyərlərə, islami dəyərlərə xidmət etmişdir. Şah İsmayılın Azərbaycan-Səfəvi dövlətinin qurulmasında Təhməzlilərin əvəzsiz xidmətləri olmuşdur. Belə ki, Şah İsmayılın ordusunda döyüş meydanlarında Təhməzli tayfasından olan cəsur, qorxmaz və düşmənə qarşı amansız olan igidlər haqqında məlumatlar şifahi olaraq son dövrlərədək kənd əhalisinə gəlib çatmışdır. Biz türklər, daima tarixi yaratmışıq, amma çox təəssüf ki, tarixi yazanlarımız az olub. Keçən əsrin sonlarınadək Qərbi Azərbaycanın Dərələyəz mahalındakı Təhməz kəndində də bu tayfanın nümayəndələri yaşayırdılar. Hal-hazırda Tərtər rayonunun Ələsgərli kəndində, Ordubad rayonunda, Ağsu rayonunun Qaraqoyunlu kəndində, Şəkinin Dərəcənnət kəndi və ona yaxın olan ərazilərdə Təhməzlilərin yaşadıqları barədə məlumatlar vardır.

XX əsrdə kəndin ictimai-siyasi durumunda bir çox hadisələr baş verib ki, onlardan da biri 1918-ci il erməni-türk müharibəsidir. Bu müharibə də Zəngəzurun, Qarabağın, İrəvan mahalının bütün bölgələri kimi Sonasar kəndinə də kifayət qədər ziyan vurmuşdur. Münaqişə başlayarkən, Zəngəzur bəylərindən olan Sultan bəy təcili səfərbərlik həyata keçirdi. Kəndlərdən cəsarətli və qorxmaz kişiləri xalqın müdafiəsinə çağırdı. İntizamlı döyüşkən dəstə yaradıldı. Orduya ağıllı, qorxmaz və vətənpərvər Seyid Həmid başçılıq edirdi. Sultan bəy Sonasarın nüfuzlu ağsaqqallarından olan Bəşir kişi və Məşədi Qulu ilə görüşüb, vətənin müdafiəsi üçün igid və cəsarətli döyüş-

çülərin lazım olduğunu, həmçinin ordunun geyim və qidayla təmin olunması üçün Sonasar kəndinin də köməyinə ehtiyac olduğunu bildirdi. Hoçaz suyun üzərində olan Sonasarlılara məxsus iki dəyirman (Hümbətin və Usufun dəyirmanı) o dövrdə tam gücü ilə ordumuz üçün çalışıb. Həmin ordunun tərkibində Sonasardan çağırılmış könüllülər düşmənə qarşı cəsarətlə vuruşublar. Onlardan bir çoxlarının göstərdikləri igidliklər hələ də xalqın yaddaşında yaşayır. Məşədi Qulunun oğlanları İsaxan, Hüseyn, Mehdi, Əmrah və nəvəsi Rəfi öz qorxmazlıqları, düşmənə qarşı amansızlıqları ilə fərqlənirdilər. Kənddən olan başqa döyüşçülər Əsgər Alı oğlu, Əkbər Alı oğlu, Musa Məmməd oğlu, İmamverdi Rza oğlu, Həsən Nayıb oğlu, Cavad Məşədi Rəhim oğlu, Ocaqverdi Haqverdi oğlu, Sevdimalı Ağa oğlu, Nəsib Salah oğlu və Rəsul Məmiş oğlu düşmən hücumunun dəf olunmasında böyük fədakarlıq göstərmişlər. Bu gərgin döyüşlərdə bir neçə məqamı xatırlatmaq istərdim. Belə ki, ermənilər artıq o dövrdə Zəngəzurun xeyli hissəsini zəbt edərək artıq Sonasarın 1-2 km-də Daşbulaq adlanan ərazidə pusqu qurmuşdular. Həmin vaxtlarda Hüseyn Naib oğlu və Musa Məmməd oğlu xüsusi tapşırıq yerinə yetirərkən ermənilərin mühasirəsinə düşmüş, axıra qədər vuruşub dörd düşmən əsgərini məhv etmiş, özləri isə qəhrəmancasına şəhidlik zirvəsinə yüksəlmişdir. Əsgər Alı oğlu öz həyatını riskə ataraq, Hüseynin meyitini düşmən nəzarətindən çıxarmışdır. 1982-ci ildə dünyasını dəyişən Rəfi Hüseyn oğlu Ağayarov o döyüşlərdən olan xatirələrini övladlarına, nəvələrinə belə nəql edərdi: Düşmənlə Sonasarın tam kənarında üz-üzə qalmışdıq ki, Nuru paşanın başçılıq etdiyi türk ordusu bizə köməyə gəldi. Hər 5-10 nəfər Azərbaycan əsgərinə 2 türk döyüşçüsü qoşulmuşdu. Andranikin xüsusi tapşırığı ilə kəndin kişiləri məhv edilməli, qız və gəlinlər əsir götürülməliydi. Səngərdə dayandığımız an 2 silahlı erməninin atlarla kəndə doğru hərəkət etdiyini gördük. Birdən türk əsgərlərindən biri bizə səslənərək: Abi, atlar bizim, üzərindəki dığalar sizin olsun dedi və o an biz atəş açdıq, hər iki ermənini yerə sərdik. Daha sonra erməni cəsədlərinin müqabilində əsir götürülmüş iki türk cəsədini geri ala bildik. Qorxaq, qəddar və insanlıqdan uzaq ermənilər rüsvaycasına məğlub oldular və Zəngəzur torpaqlarından geri çəkildilər. O tarixin ən məşhur döyüşünü qəhrəman Sultan bəy qulağı kəsik Andranikə qarşı aparmışdır. Zabux dərəsində Sultan bəy 300 nəfərdən təşkil olunmuş igidlərlə Andranikin bir neçə minlik (bəzi mənbələrdə 70-100000 nəfər göstərilir, bunu erməni süvarilərindən yığılan silahın sayı ilə təyin ediblər) peşəkar ordusunu məhv etmişdir. Bununla da Sultan bəy və onun intizamlı ordusu Qarabağı, o cümlədən bütöv Azərbaycanı erməni işğalından xilas etmişdir.

1941-1945-ci illərin dəhşətli faciəsi olan II Dünya müharibəsi də digər bölgələrdə olduğu kimi, Sonasara da kifayət qədər ziyan vurub.

Sonasardan müharibəyə göndərilənlər:

Quliyev Məhəmmədəli, Quliyev Əvəz, Quliyev Novruz, Quliyev Kərəm, Yusibov Misir, Yusibov Hüseynqulu – "Şöhrət" ordeni, Yusibov Həsənqulu – "İgidliyə görə" medal, Nəsibov Göyüş, Qaraş Hümbətoğlu, Ağayev Kərəm, İmanov Əmirxan, İsgəndərov Mustafa, Məmmədov Adıgözəl, Musayev Əşrəf, Ağayev Rüstəm, Alıyev Bəxtiyar, Əhmədov Muradəli, Xıdırov Məmmədalı, Xıdırov Qarakişi, Hacıxanov Xanlar, Rəhimov Əvəz, Əhmədov Əhmədəli, Əliyev Yusif, Əliyev Hilal, Əliyev Ağasəf, Verdiyev Əliş və Vəliyev Xəlil.

Müharibə Sonasarın inkişafını ən azı 50 il ləngitdi. 12 nəfər müharibədən qayıtmadı – həlak oldu, itkin düşdü. Qayıtmayanlar: Kərəm – orta ixtisas təhsilli mühasib, Novruz – 16 yaşında müharibəyə göndərilmişdi, Əhmədəli – milis leytenantı idi, Qaraş – 55 yaşında müharibəyə göndərilmişdi (yaşı azaldılmışdı), Yusif, Hilal, Göyüş – orta təhsilli zootexnik, Mustafa – orta təhsilli baytar həkim, Əşrəf, Qarakişi – orta təhsilli aqronom, Məmmədalı – neft mədənində usta idi, Xanlar – cəsarətli gənc.

Hərbi komissarlıqda və kənd sovetində düzgün qeydiyyat aparılmadığından bu adamların bəzilərinin varlığı və müharibəyə getməsi sübut olunmadı. Müharibədən 3 nəfər şikəst, 11 nəfər isə salamat qayıtmışdı.

Sonasarın son faciəsi 18 may 1992-ci ildə məlum hadisələrlə əlaqədar baş verdi. Sonasarlılar doğma yurdlarını tərk etdilər. 80 ailə, 300 nəfərdən çox əhali doğma yurdlarından didərgin düşdü. Kənd əhalisinin bütün əmlakı ermənilər tərəfindən qarət olundu və kənd tamamən yerlə-yeksan olundu. İşğal nəticəsində 95-dən çox ev dolu qaldı. Kənddə mədəniyyət evi, kitabxana, mağaza, məktəb (tam orta), uşaq bağçası, inzibati bina, poçt-rabitə şöbəsi, iaşə obyekti, məişət xidməti obyekti, xalçaçılıq sexi, tibb məntəqəsi, su kəməri, bərk örtüklü avtomobil yolları, yanacaq anbarı, taxıl anbarı var idi.

Kənd əhalisindən xeyli sayda cəsur, qorxmaz, vətənpərvər və qeyrətli oğlanlar Qarabağ müharibəsində iştirak ediblər. Onlardan şəhidlik və qazilik zirvəsinə ucalanlar: Muradov Mətləb Museyib oğlu (1993-cü il, Ağdərə) Yusifov İlqar Umudvar oğlu (1993-cü il, Kəlbəcər) və Məhərrəmov Şamo Tapdıq oğlu (II qrup əlil, 1993-cü il, Ağdərə).

Sonasar kəndinin məzarlığı kəndin şimala doğru çıxışında, Laçın – Alxaslı yolunun sağ kənarında düzənlikdə yerləşirdi. Məzarlıqda tarixi 750-800 ildən çox olan qəbirlər var idi. Kənd əhalisinin milli-mənəvi dəyərlərə olan ehtiramından, hər il Novruz bayramı Azərbaycanın digər bölgələrindəki kimi Sonasarda da olduqca yüksək səviyyədə qeyd olunurdu. Aşıq sənətinə, muğamata kənd əhalisi çox böyük ehtiramla qulaq asırdı. Sonasardakı toy mərasimləri 3 gün, 3 gecə davam edərdi, aşıq məclisləri qurulardı, Laçın, Kəlbəcər, Göyçə, Qarabağ aşıqları dastanlar söyləyərdi. Toy məra-

simlərində kəndin qoçaq gəncləri yaylaqlardakı cıdır düzlərində at yarışmaları, güləş meydanları, qızlar xınayaxdı mərasimləri təşkil edərdilər. Belə ki, toy mərasiminə gələn ərənlər toya cins atlarla gəlməyə üstünlük verərdilər.

**Coğrafiyası:** Laçın rayon mərkəzindən 25 km şimalda, Hoçaz çayının sağ sahilində yerləşən bu kiçik dağ kəndi özünün sanki cənnəti xatırladan füsunkar təbiəti və gözəlliyi ilə göz oxşayır. Kənd şimaldan Mişni və Alxaslı, cənubdan Hoçaz, cənub-qərbdən Mayıs, Soyuqbulaq və qismən də Qarıqışlaq, şimal-şərqdən isə Pircahan inzibati vahidləri ilə həmsərhəddir.



Kəndin yerləşdiyi ərazi dağlıq əraziyə təsadüf etsə də, kənd özü düzənlik sahədə dəniz səviyyəsindən 1250-1400 metr hündürlükdə yerləşir. Ərazidə Yura yaşlı vulkanik, Təbaşir yaşlı çökmə və Paleogen-Antropogen yaşlı vulkanik, vulkanogen-çökmə süxurlara rast gəlinir. Kəndin əkinçilik üçün torpaq sahələri, örüş, otlaq və meşə əraziləri (ərazinin təxminən 60%-dən çoxu meşəliklərlə əhatə olunub) Hoçazsu vadisindən, dəniz səviyyəsindən 1050 metr yüksəklikdən başlayaraq, Qarolan dağının qərb tərəfinə doğru dəniz səviyyəsindən 1750 metr hündürlüyədək davam edir. Hoçazsu mənbəyini Qarabağ vulkanik yaylasından (3000 m) alır, 55%-dən çoxu yeraltı sularla, digər hissəsi isə atmosfer yağıntıları ilə qidalanır. Yuxarı axınında İldırımsu, aşağı axınında Qaranlıqçay adlanır. Kənd ərazisindəki toponimlər: Qarolan, İməcilər, Aralıq, Bəriki düz, Oyankı düz, Novlu bulaq, Qozlu dərə, Kahalar, Şişlər, Quzey, Alçalı dərə, Şirinin dərəsi, Həmidin şırranı (şəlaləsi), Kahanın qabağı, Xatının qayası, Yalın üstü, Hərləmə yer, Yumru kaha, Qaçaq kahası, Qətər, Aralıq, Qaraxanlar, Əmirxanlar, Cınqır daş (uzunluğu 3 metr, eni 2 metr, qalınlığı 2 metr olan daş vurarkən cingiltili səs çıxarırdı), Qaraquş yuvası, Əyri yer, Yəhər qaya, Kəmər qaya, Gülüşuçan, Göyərçin yatan kaha, Şana koması, Tutlar, Böyük Ağsu, Kiçik Ağsu, Əli bulağı, Qavıq qayası, El yolu, Daşbulaq, Dambulaq, Su dərəsi, Qazan bulaq, Şamlar, Talalar və s. Kənd ərazisindəki, torpaq-bitki örtüyü dağ-meşə xarakterlidir. Meşələrdə əsasən dağ meşələrinə xas olan enliyarpaqlılardan nadir qırmızı palıd, şabalıdyarpaq palıd, cökə, ağcaqayın, vələs (yerli camaat ulas deyirdi), vən, akasiya, dəmirağac, şabalıd, fısdıq, meşə fındığı, qoz, ayı fındığı, alma, əzgil, armud, alça, kol bitkilərindən zoğal, zirinc, itburnu (yerli camaat həmərsin deyirdi), mundarça, gərməşoy, yemişan, moruq, qarağat, böyürtkən və s. giləmeyvələr, çılpaq dağlıq olan ərazilərdə isə ardıc yayılmışdır. Ərazidə dağ otlarından kəklikotu, qantəpər, ətotu və saysız-hesabsız dağ otları, güllər və çiçəklərə rast gəlinir, həmçinin dərman bitkiləri ilə də zən-

gindir. Yamaclıqda addımlayan zaman dağ otlarının spesifik iyi insana xoş təsir bağışlayır. Kəndin vəhşi təbiətində ayı, canavar, vaşaq, pələng (sonuncu dəfə 1965-ci ildə görüblər), kaftar, tülkü, çöl pişiyi, boz dovşan, süleysin, dələ, sincab, porsuq, oxlu kirpi, quşlardan boz kəklik, turac, adi qırqovul, qızıl qırqovul, meşə xoruzu, alabaxta, vəhşi göyərçin, zığzığ, qartal, kərkəz, quzğun, şahin, qızılquş, sürünənlərdən müxtəlif növ gürzələr (buynuzlu gürzə, uçan ilan, uzunluğu 2 metrə çatan gürzələr, şahmar ilan, qızıl ilan və s.) və müxtəlif növ kərtənkələlər (ilana ağı verən – ölçüsü 25-30 sm, aqama – ölçüsü 25-30 sm – Qafqaz üçün nadir kərtənkələ növü) rast gəlinir. Çaylarda isə qızıl balıq, göy balıq, farel və s. balıq növləri yaşayır. Bu yerlərin iqlimi yayı mülayim, bəzən isti olub iyunda 8-27 $^{0}$C təşkil edir, qışı isə soyuq olub yanvarda +3-dən -30 $^{0}$C-dək dəyişir. Yağıntıların illik miqdarı 600-900 mm təşkil edir. Xeyli sayda içməli bulaqları, müalicəvi əhəmiyyətli termal suları və qeyzer tipli bulaqları var. Cənubi Azərbaycandan Qaradağ mahalından gələn isti hava axını Həkəri və Hoçaz çaylarının vadiləri boyu kəndə doğru miqrasiya etdiyindən, torpaq örtüyünün həddindən artıq münbit olması və Mıxtökən silsiləsinin ekran rolu oynaması əkinçiliklə məşğul olmağa kifayət qədər imkan verir. Eyni zamanda onu da qeyd etmək lazımdır ki, dağlıq ərazidə yetişdirilməsi mümkün olmayan bir çox meyvə və giləmeyvə sortlarını da (tut, üzüm, nar və s.) kənd ərazisində yetişdirmək və yüksək nəticə almaq mümkündür. İşğaldan əvvəl kəndin iqtisadiyyatını əsasən qoyunçuluq, maldarlıq, əkinçilik, meyvəçilik və arıçılıq təşkil edirdi. Bunlardan əlavə kənd ərazisində, istismar üçün perspektivli mərmər və əhəngdaşı yataqları (o vaxtkı Azərbaycan SSR Dövlət Geologiya və Mineral Ehtiyatlar Komitəsi tərəfindən təsdiq edilib), kəhrəba və s. tikinti materialları ilə zəngin olan sahələr vardır.

**Əhalisi:** Sonasar kəndinin əhalisi milliyyətcə türklərdən ibarətdir. Kənd sakinləri doğma yurdlarında yaşayarkən olduqca sağlam və uzunömürlü idilər. Lakin, məcburi köçkün düşəndən sonra 60 nəfərdən çox Sonasar sakini vətən həsrəti ilə dünyasını dəyişmişdir.

İşğaldan əvvəl kənddə yaşayan əhali bir neçə tayfadan təşkil olunmuşdur: Seyidlər, İsgəndərlilər, Alıoğlular, Rəhimlilər, Qaraxanlar və s. Kəndin əhalisinin ümumi sayı 665 nəfərdir. Hal-hazırda Sonasar kəndinin əhalisi Respublikamızın 18 rayonunda məskunlaşıb.

Respublikamızın ictimai-siyasi fəaliyyətində mühüm işlərlə məşğul olan peşəkar insanlar, elm adamları və mədəniyyət işçilərinin sırasında Sonasarlılardan da az deyildir.

Sonasarın cavanları, yaşlıları doğma torpaqlarımızın azadlığı naminə və neçə illər həsrətində olduqları ata-baba yurdlarına qayıtmaq üçün hər an cənab prezidentimiz, Ali Baş Komandan İlham Əliyevin əmrini gözləyir.

**Xülasə:** Sonasar kəndi haqqında geniş məlumat yazmaq olardı. Lakin, bir çox məsələlərə aydınlıq gətirmək lazım gəldiyindən məqalənin daha geniş formatda dərc olunması bir qədər yubanır. Hal-hazırda bu yönümdə işlər gedir. Belə ki, kənd sakinlərindən, xüsusən də kəndin yaşlı adamlarından və ziyalılarından sorğular aparılmaqdadır, həmçinin tarixçilərlə də bəzi tarixi məqamlara aydınlıq gətirmək məqsədi ilə diskussiyalar aparılır. Məqalədə II Dünya müharibəsində Sonasardan iştirak edənlərin kimliyi ilə əlaqədar əldə olunan məlumatlara görə, müəllif Sonasarın ziyalıları və ağsaqqalları olan İmanov Mirzə Əmirxan oğluna və Bəşirov Mürsəl Misir oğluna öz adından səmimi minnətdarlığını bildirir. Qısa zaman kəsimində doğma Qarabağımıza, Sonasar kəndinə qayıtmaq ümidi ilə Sizlərdən ayrılıram.

**Emil Ehtiram oğlu Quliyev**



*1980-ci il yanvarın 26-da Bakı şəhərində anadan olub. Əslən Laçın rayonunun Sonasar kəndindəndir. 1998-2007-ci illərdə Bakı Dövlət Universitetinin geologiya fakültəsini əla qiymətlərlə bakalavr və magistr pillələri üzrə bitirib. 2002-2003-cü illərdə Azərbaycan Respublikası Silahlı Qüvvələrində cəbhənin Ağdam-Ağdərə-Tərtər bölgələri üzrə həqiqi hərbi xidmətdə olub və ordudan leytenant rütbəsi ilə tərxis olunub. 2003-cü ildən peşəkar fəaliyyətə başlayıb. Azərbaycan ərazisində yeraltı suların yayılma xüsusiyyətlərinin və geotektonik-geodinamik şəraitin öyrənilməsində, Böyük və Kiçik Qafqaz ərazisində bir sıra faydalı qazıntı yataqlarının (Şəmkir ərazisində İrmaşlı hematit yatağı, Şamaxı və İsmayıllı ərazisində tikinti materiallarına aid bəzi təzahürlər, Gədəbəy ərazisində Qaradağ, Cəyirçay və Xarxar qızıldaşıyan mis-porfir yataqları, Daşkəsən rayonu Çovdar qızıl yatağı və ona yaxın perspektivli ərazilər, Balakən ərazisində Filizçay, Katsdağ kolçedan polimetal yataqları) geoloji axtarışında, kəşfiyyatında və istismarında geoloq, baş geoloq və layihə rəhbəri kimi fəaliyyət göstərmişdir. Hal-hazırda təhsilini AMEA-nın Geologiya İnstitutunda doktorantura pilləsi üzrə davam etdirir və "AİMROC" Ltd (Azerbaijan International Mineral Resources Operating Company) şirkətində Çovdar qızıl mədəni üzrə baş geoloq vəzifəsində çalışır. 15 elmi məqalənin, respublikamızın iqtisadi gücünün artırılmasında əhəmiyyəti olan 10-a yaxın layihə-smetanın və 14 istehsalat hesabatının müəllifidir.*

*Ailəlidir, 3 övladı var.*

MÜSAHİBƏ

**Müsahibimiz bənzərsiz səs sahibi, istedadlı muğam ifaçısı, təkcə oxu tərzi, səhnə mədəniyyəti ilə deyil, bir şəxsiyyət kimi də milyonların qəlbinə yol tapan sevimli xanəndəmiz Ehtiram Hüseynovdur.**



## "GÖZƏ GİRƏ-GİRƏ GÖZDƏN DÜŞƏNLƏRİ DƏ ÇOX GÖRMÜŞÜK"

***– Mən sizə Ehtiram müəllim də deyərəm, Ehtiram bəy də. Bu müraciətlərin hər birinə layiqsiz və nəsil şəcərəniz də Bülövlük bəylərinə gedib çıxır. Amma yaş fərqimizi nəzərə alıb Sizə ərkyana "müəllim"siz və "bəy"siz müraciət edəcəm ki, söhbətimiz daha səmimi alınsın.***

– Həm yaş fərqinə görə, həm bir laçınlı kimi necə rahatdırsa o cür də müraciət edin.

***– Sizin əslində tanıtıma ehtiyacınız yoxdur. Böyük tamaşaçı sevgisi qazanmısız. Biz isə ənənəvi sualımızı ixtisasından, vəzifəsindən asılı olmayaraq bütün müsahiblərimizə veririk. Çünki müsahiblərimizin tərcümeyi-halı oxucular üçün həmişə maraqlıdır. Bu baxımdan qısa bioqrafiyanızı oxucularımızla bölüşmənizi istərdik.***

– 1980-ci il oktyabrın 18-də Laçın rayonunun Hacısamlı kəndində anadan olmuşam. Əslimiz Daşlı kəndindəndir. Babamın işiylə əlaqədar Hacısamlıya köçmüşük. 1986-cı ildə həmin kənddə I sinfə getmişəm. 1992-ci ildə məlum səbəblərdən Bakıda məskunlaşaraq orta təhsilimi Binəqədi rayonundakı 284 saylı orta məktəbdə davam etdirmişəm. O vaxtlar televiziyada "Sübh şəfəqləri", "7-17" uşaq müsabiqələri gedirdi. Babam məni "Sülh şəfəqləri" müsabiqəsinə apardı. 12 yaşım vardı. Rəhmətlik Əfsər Cavanşirov "Bənövşə" uşaq xorunun həm yaradıcısı, həm də rejissoru idi. Hansı musiqi məktəbindən gəldiyimi, müəllimimin kim olduğunu soruşdu. Rəhmətlik babam dedi ki, Allahın verdiyi səsdir, öz havasına oxuyur. Müəllim yanına getmir. Məktəb tədbirlərində də oxutdururlar. Əfsər müəllim məni "Bənövşə" uşaq xoruna götürdü və bildirdi ki, müsabiqə üçün hələ hazır deyil, hazırlaşmalıdır. Beləliklə, ilk addımlarımı orada atmağa başladım. Uşaq mahnılarından ibarət kompozisiyaların lent yazıları Azərbaycan Televiziyasının fondunda indi də durur. Uşaq mahnılarının arasında kiçik muğam yerləri olanda rəhmətlik Əfsər müəllim deyərdi ki, Ehtiram oxusun. Sonra Xan Şuşinski adına Muğam məktəbini, Asəf Zeynallı adına Musiqi Texnikumunu, – indi kollec adlanır, – bitirdim. Xalq artisti Canəli Əkbərov-

dan 4 il dərs aldım. Daha sonra müsabiqələr, musiqi yarışmaları... Hal-hazırda Milli Konservatoriyanın magistr pilləsində axırıncı kurs tələbəsiyəm. Müəllimim Xalq artisti Arif Babayevdir.

***– İlk dəfə nə vaxt hiss etdiniz ki, səsiniz var? İlk dinləyiciniz kim olub?***

– Bizim bir musiqi müəlliməmiz vardı. Ağdamdan gəlin gəlmişdi, amma əslən o da Laçından idi. Həmişə sinifdə oxutdururdu məni. Təəssüf ki, kənddə o müəllimədən başqa heç kim məni oxuyan kimi tanımadı. Məktəbdə tədbir, kənddə toy-zad olanda uşaqları oxutdururdular. Ürəyim partlayırdı ki, kaş mənə də nəsə oxutdursunlar. Kənddə, rayonda bir tədbir olanda desinlər ki, bu uşaq da gəlsin. Bəlkə də bir uşaqlıq arzusuydu, ürəyimdə qaldı. Bilirsiz də, bizim nəsildə oxuyan çoxdur. Əsas ana tərəfimdədir səs. O zaman yazdırılan kasetlərin hamısı qaldı Laçında.

Dayımın toyunda uşaqların hamısı oxuyurdu. Mən də oxumaq istəyirdim. Deyirdilər sən kiri, oxuya bilmirsən. Anamın əmisi nəvəsi, Nadir müəllimin oğlu Ramiz çox yaxşı oxuyurdu. Xaricə də gedib-gəldi. Tay-tuş idik, gözəl səsi vardı. Səhlənkarlıq elədi, sənətin dalınca düşmədi. Bu iş də elədir ki, bir dəfə buraxsan sonra yerini doldura bilmirsən. Gərək ayrılmayasan. Nəsildə bəlkə də ən zəif səsi olan mən olmuşam. Güclü istəyim, həvəsim olduğuna görə davam etmişəm. Həmid babamın səsi olub, elə indi də var. 70-dən artıq yaşı olmasına baxmayaraq oxuyanda elə bilirsən ki, hazır xanəndədir. Hacı dayımın, Ətraf dayımın da səsi var. Bizim ailə məclislərimizdə musiqiçi dostlarım deyirlər ki, sizdə hamı oxuyur ki. Dayım uşaqları muğam məktəbinə gedirlər. İngilislər Azərbaycanda muğamın inkişafı, uşaqlara kiçik yaşlarından muğamın öyrədilməsi barədə sənədli film çəkmişdilər. Hacı dayımın, Ətraf dayımın uşaqları da həmin filmə çəkiliblər. Səs var ki, üzərində işləmək lazımdır, oxumağa yönəldilməlidir. Amma bizim nəsildə olan səsin 99 faizi hazır səsdir.

“Xəzər” televiziyasının “Ay Zaur” verilişi bizdə çəkiliş aparanda babam 2-3 dəqiqəlik bir muğam parçası oxudu. Allah böyük sənətkarımız Habil Əliyevə cansağlığı versin, evdə qonaq idi. Dedi ki, bu kişi əməlli-başlı xanəndə imiş, nətər olub indiyə kimi tanımamışam? Elə bilmişdi ki, neçə ilin oxuyanıdır. Halbuki toya getməyib, konsertə getməyib, özü üçün oxuyub. Bayaq dediyim kimi, səs hazır səsdir. Səs var ki, üzərində çox işləməlisən, özünü “öldürməlisən”.

***– Nəslinizdən səsi olan daha kimlərin adını çəkərdiniz?***

– Məndən başqa təkcə Murad dayıdır bu sənəti davam etdirən. Amma Allahın köməyi ilə davamçılar yetişir.

***– Belə çıxır ki, uşaqlıqdan meyliniz yalnız xanəndəliyə olub. Yəni seçim qarşısında qalmamısız.***

– Biz gözümüzü açıb elə görmüşdük. Rəhmətlik Yaqub Məmmədov oxuyanda hamımız yığışıb qulaq asardıq. Radioda, televiziyada muğama müəyyən saatlarda vaxt ayrılırdı. Tanınmış muğam ifaçılarına həsədlə baxardıq, onlarla rastlaşanda, görüşəndə sevincimiz yerə-göyə sığmazdı. Yeri gəlmişkən, bir epizodu xatırladım. Şəlvədə rəhmətlik Salman Salahovun oğlunun toyuna məni də aparmışdılar. 80-ci illərin axırıydı. Yadımdadır ki, payız ayıydı, havanın soyuq vaxtıydı, yağış yağırdı. Stolun qabağında peç qoymuşdular. Musiqiçilər də stolun o üzündən səhnədə əyləşmişdilər. Mən də balaca uşaq. Girib stolun altında oturmuşam. Necə olubsa, peçin istisində yuxuya getmişəm. Gecə saat 10-11-də Arif müəllim deyib ki, bu uşağı götürün, yatıb qalıb burada. Allahın qismətinə bax ki, sonralar Arif müəllimin tələbəsi oldum. Taleyin işidir. O qədər belə epizodlar olur ki. Arif müəllimin yadına düşmədi, amma o toy yadındadır. Onu da deyim ki, həmin toyda Arif Babayevi tarda Ağasəlim Abdullayev, kamançada Mirnazim Əsədullayev müşayiət edib.

***– Laçından çıxanda 12 yaşınız olub. Uşaqlıq yaddaşı möhkəm olur. Laçını necə xatırlayırsız?***

– Laçını yaxşı xatırlayıram, yadımda çox şey qalıb. Rəhmətlik Heydər babam məni çox istəyirdi, özüylə hər yerə aparırdı. Təbiətlə bağlı adam idi. Dəfələrlə Minkənddə, İstisuda olmuşam. Ən çox yadımda qalan kəndimizin ortasından axan çaydı. Nə vaxtsa qismət olsa, Laçına qayıtsaq Şəlvə dərəsindən Oğuldərəyə, Qovuşuğa, Nərdivanacan təkbaşına gedib çıxa bilərəm. O yerlər kəndbəkənd yadımdadır. Uşaq vaxtı maraqlı əhvalatlar çox olub. Ən yadda qalanı 3 il dalbadal hər yay qolumu sındırmağımdır. Qolum gipsdə olub, ora-bura getməyə qoymayıblar.

***– Orta məktəbdə necə oxumusuz?***

– Bilirsiz də, bizim nəsildə əksəriyyət savadlıdır. Atam, əmim, qohumların çoxu. 9-cu sinfə qədər orta səviyyədə oxumuşam. Nə əlaçı olmuşam, nə də zəif oxuyan. 9-cu sinifdən sonra artıq məktəbdə hamı məni tanıyırdı. Direktorun ən çox istədiyi şagird idim. Çünki məktəbin, rayonun bütün tədbirlərində fəal iştirak edirdim. Heç kim məni hansısa fənni oxumadığıma, dərsə gəlmədiyimə görə danlamırdı. Belə deyək də, nə evdə, nə məktəbdə mənə "dəymədilər".

***– Məşhur olmağın hansı müsbət və ya mənfi cəhətləri var?***

– Məşhur olmağın müsbət cəhəti çoxdur. Eyni zamanda məsuliyyəti böyükdür. Mən əvvəldən sərbəst olmamışam, həmişə özümə nəzarət etmişəm. Filan yerə gedəndə özünü necə aparmalısan, az danışmalısan, bu hərəkəti eləməməlisən, sakit durmalısan və sair. Yəni özümə qadağalar qoymuşam. Mənfi cəhəti, – əslində mənfi cəhət də deməzdim, – odur ki, bəzən məş-

hurluqdan yorulursan. Belə hallarda dostlarımızla, – onlar da kifayət qədər tanınan televiziya aparıcıları, xanəndələr, estrada ifaçılarıdır, – qərara gəlirik ki, heç kəsin olmadığı bir məkana üz tutaq. Sərbəstləşək, ucadan qışqıraq, deyib-gülək. Bu da həmişə olmur axı. İldə uzağı 2-3 dəfə belə imkan yaranır.

Hamıya məlumdur ki, estrada ifaçılarını daha böyük kütlə tanıyır. Ancaq ciddi musiqi ilə, muğam janrı ilə məşğul olanlara estrada ifaçılarına nisbətən hörmət daha çoxdur. Məclislərə, konsertlərə, tədbirlərə, xarici ölkələrə gedəndə dəfələrlə bunun şahidi olmuşam. Görünür, bu hörmət muğamın böyüklüyündən, xalqın sonsuz sevgisindən irəli gəlir. Muğamın mahiyyəti elədir ki, saqqal saxlaya, sırğa taxa bilməzsən, özünü ağır aparmalısan. İstər 15 yaşında ol, istərsə 60 yaşında. Yüngül xasiyyətli insan da olsan, məcbursan ki, özünü düzəldəsən.



***– Qastrol səfərlərindən təəssüratlarınızı bölüşərdiniz. Ən çox yadınızda qalan ölkə hansı olub? Haranısa Azərbaycana, Laçına oxşatmısızmı?***

– Qastrol səfərlərində çox olmuşam. 2007-ci ildə ikinci muğam müsabiqəsinə qatıldım. Ondan qabaq da muğam teatrında çalışmışam. Birinci müsabiqə 2005-ci ildə keçirilmişdi. 2011-ci ildi Beynəlxalq Muğam Müsabiqəsinin qalibi oldum. Bundan sonra xarici səfərlərimin sayı xeyli artdı. Son dövrlərdə səfərlərimiz haqqında hamının xəbər tutması sosial şəbəkə-

lərlə bağlıdır. Bir ildir ki, mən də sosial şəbəkələrdə varam. Feysbuk səhifəmə şəkillər yerləşdirirəm, hamı bilir ki, hara gedib-gəlmişəm. Getdiyim ölkələrdə məndən ötrü ən doğma yer Təbrizdir. Burada özümü çox rahat hiss edirəm. Elə bilirəm Qarabağdayam. Yəqin ki, bu doğmalıq təkcə havasına, təbiətinə görə deyil. Ona qalsa İsveçrənin təbiəti daha gözəldir. O gün bir yerdə dedim ki, orada moruq, çiyələk çox dadlıdır, lap Laçındakı kimidir. Laçınlılar dedilər ki, Laçındakı moruğun, çiyələyin dadını verə bilməz. Söz yox ki, Vətən torpağında bitən meyvənin də, giləmeyvənin də dadı əvəzedilməzdir. Fransaya festivala getmişdik. İsveçrə ilə Fransanın arası çox gözəl dağlıq ərazidir. Meşənin içi, çox mənzərəli bir yer. Gündə 3 dəfə yağış yağır, 10-15 dəqiqədən sonra hava açır. Cenevrədən təyyarə ilə getmişdik ora. Qayıdanda səfər yoldaşlarımızdan biri özünü pis hiss elədi. Maşını saxlayası olduq. Düşdüm ki, hər tərəf moruqdu. O qədər ləzzət elədi ki. İsmayıllıda, Şamaxıda, dağlıq yerlərdə elə təbiət görməmişəm. Ancaq bir az Hacıkəndin təbiətinə oxşayır.

Eyni dildə danışdığımız Türkiyə bizə xüsusilə doğmadır. Rizə tərəfi əsasən yaylaqlardan ibarətdir, olduqca gözəldir. İyulun axırı, avqustun əvvəli ot biçini olur. Yadımdadır ki, Laçında da ot biçini o vaxt başlayırdı. Nədənsə oranı bizim Nərdivana bənzədirəm.

***– Uşaqlıq dostlarınızla əlaqə saxlaya bilirsinizmi? Bəzən onlara vaxt ayıra bilmədiyiniz üçün sizdən incimirlər ki?***

– Kəndimiz balaca kənd idi. 3 nəfər tay-tuş idik. Biri qohum olduğundan tez-tez görüşürük. Biri ilə də arabir zəngləşirik, mütəmadi görüşmürük. Amma sonrakı uşaqlıq dostlarımla müntəzəm əlaqə saxlayıram. Onların da sayı çox deyil, 2-3 nəfərdir. Sağ olsunlar, məni başa düşürlər və vaxt qıtlığını nəzərə alırlar.

***– Yeri gəlmişkən, feysbuk sosial şəbəkəsinin fəal istifadəçisi olmağınız fəaliyyətinizdə və şəxsi həyatınızda problem yaratmır ki?***

– Yox, problem yaratmır. Əvvəlcə feysbuka telefonla da baxırdım. Sonra gördüm ki, çatdıra bilmirəm. İndi telefonda feysbuku açmıram. Gecə saat 2-3-dən sonra təxminən yarım saat, bir saat vaxt ayırıram. Kiminsə mesajına gec cavab yazıram, ya da cavab yazmağa vaxtım olmur. Gərək feysbuk dostlarım buna anlayışla yanaşıb məndən inciməsinlər.

***– Sənət adamları tez-tez onlara sevgi mesajlarının gəldiyini deyirlər. Sizə necə, yoxsa pərəstişkarlarınız ciddi xasiyyətinizi nəzərə alırlar?***

– Dostlarla oturanda feysbukdan da söhbət düşür. Sənət adamları, qeyri sənət adamları deyirlər ki, mənə elə mesaj gəldi, belə mesaj gəldi. İnanın səmimiyyətimə, bunu tanıdığınız laçınlılardan da, hər gün oturub-durduğumuz

dostlardan da soruşa bilərsiniz. Onlara deyirəm ki, nətər olur e, sizə gələn mesajlardan mənə bircə dəfə də gəlməyib.

Feysbukun üstünlüklərindən də danışım. Dostluğumda olanların 70 faizdən çoxu şəxsən tanımadığım laçınlılardır. Razıyam ki, laçınlılarla çox təmasda oldum. Ona qədər məni qınayırdılar ki, laçınlılarla yaxınlıq eləmirsən, qaçırsan, başqa adamlarla oturub-durursan. Təsadüfən rastlaşdığın bir adamla o saat qaynayıb-qarışmaq da alınmır axı. Münasibət qurmağa vaxt lazımdır. Laçınlı uşaqlar var ki, tez-tez telefonla danışırıq, görüşürük. "Axşamüstü Qarabağdan" adlandırdığımız solo konsertimə hazırlıq mərhələsində də mənə çox yaxından kömək edirlər. Hiss edirəm ki, Siyavuş Əmirli, Aqil Səfərəliyev, İbrahim Mirzəyev, Xatirə Laçın və adlarını çəkmədiyim dostların hər biri əmisi oğlu kimi, dayısı oğlu kimi, doğması kimi can yandırır. Qısa müddət içində bu boyda səmimiyyət bəlkə də çətindir.

"Laçın və laçınlılar" qrupunun təşəbbüsü ilə keçirilən tədbirlərdə, görüşlərdə imkanım daxilində iştirak edirəm. Sosial şəbəkədə xüsusi fəallığı ilə seçilən bu qrupun laçınlıları bir-birinə yaxından tanıtmaqda rolu əvəzsizdir.

***– Feysbuk səhifəmizdə sizdən müsahibə alacağımız barədə məlumat vermişdik və dostlardan xahiş etmişdik ki, onları maraqlandıran sualları Ehtirama ünvanlasınlar. Məqam yetişdi ki, həmin suallara da cavab alaq.***

– Mən də elə bilirdim müsahibə artıq yekunlaşır. Suallar təzə başlayırmış ki...

***Üzeyir Cəfərov: – Sənətdə hədəfiniz nədir? İnşallah Laçın azad edildikdən sonra orada ilk oxuyacağınız nə olardı?***

– Allah qismət eləsin Laçına qayıdaq. İlk dəfə döyüşə-döyüşə getmək istərdim ora. Həmin vaxt bəlkə elə bir ruh gəldi ki, şeir yazdım, musiqi bəstələdim. Nə oxuyacağımı dəqiq bilməsəm də, dağlarla bağlı segah üstə içimdən gələn bir muğam parçası oxuyardım.

Hər sənətə aiddir. Əslində sənətin zirvəsi yoxdur. Çünki hər zirvədən sonra yeni bir zirvə başlayır. Rəmzi mənada isə xanəndəlik sənətində böyük zirvələr var – Arif Babayev, Alim Qasımov zirvəsi. O zirvələr əlçatmazdır. Əsas hədəfim odur ki, həmişə seçilim. Uşaqlığımdan qarşıma məqsəd qoymuşam ki, başqa xanəndələrdən yaxşı mənada nəyləsə fərqlənim.

***Elnur Baxış: – Layiq olduğunuza nail ola bilmisinizmi?***

– Bu suala qismən cavab verdim. İnsan nə qədər uğur qazansa da, həmişə ondan yaxşısına nail olmaq istəyir. Bu mənada hələ layiq olduğuma nail ola bilməmişəm. Daha doğrusu, səs imkanlarımdan yetərincə yararlanmamışam.

***Hacı Məhəmməd: – Oxu tərzinizi Əbülfət Əliyevə oxşadanlar çoxdur. Bunun nədən qaynaqlanması haqda sizin fikrinizi bilmək maraqlıdır.***

– Əbülfət Əliyevə çox qulaq asmışam. Mənim nənəm seyid nəslindəndir, çox ağır seyiddir. Uşaq vaxtı məni Əbülfət Əliyevə oxşadırdı. Anadan olandan məni oxşamalarla əzizləyib. Qohumlar həmişə deyir ki, nənən o qədər dedi-dedi, axırda hamı səni tanıdı. O arvadın nəfəsi sənə yar oldu, "Hamı sənə etsin Ehtiram!" arzusu çin çıxdı. Nənəmin də səsi var. Bizə gələn səs Bülövlük bəylərinin səsidir və milyon səsin içindən seçilir. İstəmişəm ki, seçilim. Allah da fərqli səs verib.

***Şölə Məmmədli: – Bir erməni ilə üz-üzə gəlsən nə edərdin?***

– Ermənilərlə Avropada, Rusiyada çox üz-üzə gəlmişəm. Tanınmış dirijorumuz Azad müəllimə Allah rəhmət eləsin. Riqa Dövlət Filarmoniyasının orkestrinə dirijorluq edirdi. Yarım saat orkestr çıxış edirdi, yarım saat muğam üçlüyü – tarda Sahib Paşazadə, kamançada Toğrul Əsədullayev və mən. Səhnə arxasında duranda bir nəfər kamançaya baxıb o birinə rusca dedi ki, bu, erməni musiqi alətidir. Biz qəti şəkildə və haqlı olaraq kamançanın Azərbaycana məxsus musiqi aləti olduğunu bildirdik. Dava da düşə bilərdi.

İnternetdən də izləmək mümkündür ki, İrəvanın mərkəzində bir akardion çalan Bəhram Nəsibovun mahnılarını ifa edir. Bir kafedə Röyanın mahnılarını oxudurlar. Üzdəniraq qonşularımız bu gün də bizim musiqilərimizə müraciət edirlər, çünki özlərinin milli musiqisi yoxdur. Musiqiçi olduğum üçün bu məsələyə toxundum və bəlkə də sualdan yayındım. Təbii ki, döyüş meydanında erməni ilə üz-üzə gəlsəydim musiqiçi kimi davranmazdım.

***Şəms Süleymanlı: – Mənim fikrimcə, muğam insana yeni ruh verir. Hətta əsəbləri gərgin insanları muğamla sakitləşdirmək mümkündür. Bəs sevimli xanəndəmiz necə düşünür? Muğamın müalicəvi əhəmiyyəti varmı?***

– Həkimlər də təsdiqləyirlər ki, musiqinin müalicəvi əhəmiyyəti var. Muğama qulaq asanda çox fikrə gedirəm. Böyük xanəndələrə qulaq asanda fikirləşirəm ki, bu boyda sənətkarlar varkən, biz necə gəlib düşdük bura, axırımız nətər olacaq? Bəzi musiqiyə qulaq asanda isə deyirəm ki, məndən yoxdur. Hərdən məndən soruşurlar ki, filan mahnıya niyə qulaq asırsan? Cavab verirəm ki, Yaqub Məmmədovun lent yazısına qulaq asandan sonra oxumağımdan zəhləm gedir. Filankəsi dinləyəndə isə kef eləyirəm ki, bundan yaxşı oxuyuram. Əsəblərimi sakitləşdirirəm.

***Musa Məmmədov: – Hansı muğamı və ya mahnını oxuyanda təskinlik tapırsız? Əsasən də Vətənlə bağlı?***

– Konkret hansı muğamı və mahnını oxuyanda təskinlik tapdığımı deyə bilmərəm. Zamandan və məkandan asılıdır.

***Xatirə Laçın: – Gerçək istedad möcüzə kimi bir şeydir. Allah vergisidir və bu vergi daşıyıcıları seçilmiş bəndələrdir. Yəni şairlər, yazarlar, sehrli səs sahibləri və s. seçilmiş insanlardır, məncə. Bu cür insanlar on-***

***lara bəxş edilən dəyərin qiymətini bilməlidirlər və hətta buna borcludurlar. Çünki bu cür istedadlardan bütöv bir el, bütöv bir xalq bəhrələnir. Bu baxımdan Ehtiram bizim hamımızın səsimizdir. Ehtiram Hüseynova sual edərdim ki, onun vasitəsilə Azərbaycan xalqına, bizlərə bəxş edilmiş bu dəyəri qorumağa çalışırmı?***

– Müğənnilər, xüsusilə xanəndələr üçün çox məhdudiyyətlər var. Başqa xanəndə dostlarımla müqayisədə səsimi çox qorumuram, səsimin üstündə əsmirəm. Hava şəraitinə uyğun kiminsə başına papaq qoymasına, qulağına nəsə tutmasına, ağzını şərflə bağlamasına pis baxmıram. Deyim ki, özünü hər hava şəraitinə öyrəşdirmək də vacibdir. Elə olur ki, eyni havada, eyni maşında 3-4 xanəndə ilə səfərə çıxırıq. Biri xəstələnir, biri xəstələnmir. Hər halda çalışıram ki, səsimi qoruyum. Allahın verdiyi səsə biganə qalmaq günahdır.

***Fuad Nərimanlı: – Ehtiram bəy, özünüzü imtahandakı kimi hiss etmədiniz?***

– Tələbə, şagird imtahana hazırlıqsız gedəndə, bir şey bilməyəndə narahat olur. Amma bilirəm ki, sizin suallar sənətlə bağlıdır. Cavab verməyə çətinlik çəkmirəm, şəxsi fikirlərimi öz tərzimdə çatdırıram.

Əgər solo konsert nəzərdə tutulubsa doğrudan da çox həyəcanlıyam. İlk növbədə nə gözləsəm özümdən gözləyirəm. Bir də konsertə böyük sənətkarımız Malik Mansurovun rəhbərlik etməsinə arxayınam. Azərbaycan musiqisində onun gördüyü işlər kifayət qədərdir. Adam var ki, bir çöpü götürüb qoyanda da hay-həşir salır. Adam da var ki, elədiklərini heç vaxt demir. Malik Mansurov məhz belə sənətkarlardandır.

Malik müəllim bu konserti elə qurub ki, oxumasam belə, təkcə musiqiyə görə qiyməti "5"-dir. Oxuya bilsəm də normal nəsə alınacaq. Narahatçılığım özümdəndir ki, səhnə həyəcanım ötüb keçmir. 1993-cü ildən səhnədəyəm. Saysız-hesabsız çıxışlarım olub. Muğam Mərkəzi açılandan ayda 2-3 dəfə onun səhnəsinə çıxıram. Amma hər dəfə dizlərim əsir. Solo konsertin məsuliyyətini yaxşı anlayıram. 400-ə yaxın insan mənə qulaq asmağa gəlir. Borcumdur ki, onları razı yola salım.

***Əjdər Hümbət: – Hansı sualın sizə verilməsini istərdiniz və o suala cavabınız necə olardı?***

– İndi hara gedirəmsə konsertlə bağlı sual verilməsini istəyirəm. Məni bir efirə çağırmışdılar. Gördüm ki, aparıcı solo konsertim haqqında məlumatsızdır. Tez yadına saldım ki, konsertlə bağlı sual versin. Hələlik afişa da vurulmayıb, reklam yalnız sosial şəbəkələrdə aparılır. Tələbat olsa inşallah gələn ilin mayında daha böyük tamaşaçı auditoriyası üçün solo konsert verəcəm.

***Qəzənfər Hüseyn: – "Şou-biznes" deyilən bataqlıqdan uzaq durmağı necə bacardın? Bu qədər abır-həyalı olmağın sənətindəki irəliləyişə və səsindən qazandığın dolanacağına mane olmur ki?***

– Şou-biznesdən aralı durmağım janrla bağlıdır. Yox, gözə girməməyim sənətdə irəliləyişimə və dolanacağıma mane olmur. Əksinə, gözə girə-girə gözdən düşənləri də çox görmüşük. Şəxsən özüm də alış-veriş zamanı mənə lazım olan nəyisə malını tərifləyəndən yox, sakitcə kənarda durub müştəri gözləyəndən alıram. Bizim sənətdə də buna bənzər hallarla rastlaşırıq. Adamlar bəzən tez-tez görünmək, məclis "tutmaq" üçün əldən-ayaqdan gedənlərdən bezirlər. Abrına qısılıb qıraqda duranları daha çox önə çıxarırlar. Bir də gərək bəndə unutmasın ki, ruzini verən Allahdır.

***Nurema Qəlbinur: – Allah bağışlayandır, o necə, taleyin hər zərbəsinə dözüb bağışlamağı bacara bilərmi?***

– Mən kimdənsə inciyə bilərəm. Küsdüyüm insanla ya tez, ya gec barışaram. Bağışlamaq isə təkcə Allaha məxsusdur.

***İradə Polad: – Laçın deyərkən, öncə nə gəlir fikrinizə? Ehtiram göründüyü kimidirmi?***

– Laçın deyəndə fikrimə nədənsə həmişə toy gəlir. Laçında toylar 3 gün 3 gecə olurdu və çox maraqlı keçirdi. Yadımdadır ki, bəyi toy mağarına gətirəndə kəllə yandırırdılar. Toylarda at çapmaq da dəb idi.

İkinci sualın cavabını isə düşünürəm ki, məndən yox, məni tanıyanlardan soruşmaq lazımdır.

***Xan Ziyad: – Bilmək istərdim ki, Ehtiram bəy uduzmağı qəbul edirmi? Bir də stolüstü oyunlardan ən çox hansını oynamağı sevir?***

– Uduzmağı qəbul edirəm, amma barışmıram. İlk növbədə uduzmağın səbəbini bilmək lazımdır. 2005-ci ildə keçirilən müsabiqədə 20-liyə düşmədim. Ondan əvvəlki müsabiqələrə də düşə bilməmişdim. Doğru deyiblər ki, yanlış da bir naxışdır, hər şərdə bir xeyir var. Allahın böyüklüyünə min şükür. 2007-ci ildə müsabiqəyə qatıldım və ikinci yerə layiq görüldüm. Həm də müsabiqə SMS-siz oldu.

2009-cu il müsabiqəsində iştirakdan imtina etməyim səs-küylə qarşılandı. Məni qınayanlar və müsabiqədə iştirak etməməyimi istədikləri kimi yozanlar da tapıldı. Axırda söz-söhbətə son qoymaq üçün müsabiqəyə hazır olmadığımı dedim.

2011-ci ildə isə Beynəlxalq Muğam Müsabiqəsinin qalibi oldum. Bu müsabiqəyə 28 ölkədən muğam ifaçıları qatılmışdı. Münsiflər heyətinə 7-8 ölkənin nümayəndəsi daxil edilmişdi. Onların arasında Fransa, İngiltərə, İran, Türkiyə Qazaxıstan və digər ölkələrin təmsilçiləri də vardı. Milli Konservatoriyanın rektoru, Xalq artisti Siyavuş Kərimi və Xalq artistləri Arif Babayev, Ramiz Zöhrabov da müsabiqənin münsiflər heyətinin üzvü idilər.

Müsabiqə bitəndən sonra böyük həyəcanla nəticənin elan olunmasını gözləyirdim. Yadımdadır ki, Təyyar Bayramov, Qəzənfər Abbasov, tar çalan Valeh müəllimlə bir yerdə oturmuşduq. Birdən mənə zəng gəldi. Cavab vermək üçün ayağa durub kənara çəkildim. Necə olubsa, münsiflər tərəfə yaxınlaşmışam. Həmin anda Arif müəllim dedi ki, birinci yeri sənə verdilər, amma heç kəsə bildirmə. Özümü itirmiş halda geriyə qayıtdım. Təyyar əhvalımın dəyişdiyini görüb soruşdu ki, nolub? – "Özünü itirmə".

Ömrümdə o qədər sevinməmişdim. Aradan 3 ildən artıq vaxt keçib. Hələ də o zaman yaşadığım sevinc hissini sözlə ifadə etməkdə çətinlik çəkirəm. 3-4 ay özümə sual verdim ki, bu nətər oldu?

Siyavuş Kərimi televiziyada da dedi ki, Ehtiramdan bunu gözləmirdim. Allahımdan çox razıyam ki, ürəkdən nə istəmişəmsə verib. 7-8 ay əvvəl televiziyada Braziliya haqqında maraqlı bir veriliş gedirdi. Ürəyimdən bu ölkəyə səyahət arzusu keçdi. Aradan 15-20 gün ötməmiş Braziliyaya dəvət aldım. Üstəlik həmin dəvətə Argentinaya səyahət də daxil edilmişdi. İnşallah, Misirə, Qüdsə də səyahət etmək arzusundayam.

Stolüstü oyunlardan nərdi sevirəm. Oyunda uduzmağı xoşlamıram. Etiraf edim ki, nərddə Ziyada uduzanda cığallığım da olur.

***Aqil Azəri Səfərəliyev: – Siqareti tərgitmək çoxmu çətindir?***

– Bəlkə o sualı Aqil qarışıq oradan çıxardaq? Dostumuzdur, inciməz.

***Əlibala Ağayev: – Bəzən evdən kənarda özünü ağır aparan insanlar evdə çox çılğın olurlar. Bəs Ehtiram bəy necədir?***

– Evdə nətərəmsə, kənarda da eləyəm. Əslində bu sualın da cavabı evdəkilərdən soruşulmalıdır.

***Zahir Abbas: – Ehtiramın da tamaşaçı olduğunu nəzərə alıb özündən və sevənlərindən istərdim cavab alım. Biz Ehtiramı tək Laçınla bağlayanda və yaxud ona bir elin-obanın sənətkarı deyəndə sənətinə bir balaca da olsa xələl gətirmirikmi?***

– Yaxşı sualdı. Çox adam məni bakılı bilirdi, şirvanlı bilənlər də vardı. 4 il əvvəl Bakı haqqında bir filmə də çəkilmişdim. Artıq laçınlı olduğumu hamı bilir. Razıyam ki, sənətkar üçün sərhəd yoxdur və onu hansısa bölgə ilə məhdudlaşdırmaq düzgün deyil. Amma hər kəsin dünyaya gəldiyi bir məkan var ki, bunu da danmaq olmaz. Bu mənada laçınlı, bütövlükdə isə azərbaycanlı olmağımla qürur duyuram.

Bir haşiyəyə çıxım. Hamıya məlumdur ki, Nardaranda muğama sevgi çox güclüdür. İllər öncə Nardarana toya dəvət etmişdilər. Həmin ərəfədə Qazaxıstana qastrola gedəsi oldum. Toya 15 gün qalmış ev yiyəsinə dedim ki, kimi istəyirsən gətirim, lap musiqiçilərin xərcini də ödəyim. Etirazını bildirdi ki, heç kim lazım deyil, özüm oxuyacam. İnciməyə haqqı da vardı, çünki 7-8

ay əvvəl o toyda iştirak edəcəyimə söz vermişdim. Bundan sonra elə marşrut seçdim ki, həm qastrola getdim, həm də özümü toya çatdırdım. Allah Hacı Kərimə, bizim gözəl qəzəlxanımız, şairimiz, ağsaqqalımız Hacı Ələmdar Mahirə rəhmət eləsin! Hər ikisi xətrimi çox istəyirdi. Hacı Kərim demişdi ki, bu kənddə bütün toyları sən aparacaqsan. Bir müddət getdim. Sonra bir nəfər xətrimə dəymişdi. İndi də gedirəm. Hər dəfə deyirlər ki, o adamı göstər, sənin işin yoxdur. Getdiyim toyların heç birində həmin adama rast gəlmirəm. Altı ildir bu kənddə toy aparıram, hələ kimsə deməyib ki, nəyisə oxu. Məsələn, sərpayı yaxınlaşır ki, qonağımız "Zabul" istəyir, amma ürəyin istəyirsə başqa şey oxu. Tək mənə yox, muğama hörmət edirlər. Yaqub Məmmədova bu kənddə böyük hörmət olub. Hətta səsinin batdığı illərdə də onu toya gətiriblər. Hacıbaba Hüseynov, Ağaxan Abdullayev və Alim Qasımovun oxuduğu toylarda Yaqub Məmmədov üçün də pul ayırıblar. Nardarana toya gedəndə heç vaxt qiymət demirəm. Söz vermişəmsə gedirəm.

***Qabil Zimistanoğlu: – Məhəbbət Kazımovun "Laçınım" mahnısını dinləyəndə hansı hisslər keçirirsiz?***

– Allah Məhəbbət Kazımova rəhmət eləsin! Laçın adı çəkiləndə istər-istəməz Məhəbbət Kazımov yada düşür. Nə qədər ki, millət var, sənət var Məhəbbət yaşayacaq. Həmişə heyifslənmişəm ki, Məhəbbət müəllim muğamla müntəzəm məşğul olmayıb. Azərbaycan Televiziyasının Fondunda onun da ifa etdiyi "Mirzə Hüseyn" dəsgahı var. Səs imkanları həddindən artıq böyük idi. Daha çox mahnı janrında ifaları qalıb. Oxuduğu muğamları lentə yazdırmayıb.

"Laçınım" mahnısı laçınlıların himnidir. Bu mahnını dinləyəndə mən də bütün laçınlıların keçirdiyi hissi keçirirəm.

***– Heydər Əliyev Fondunun muğamın inkişafında rolunu necə qiymətləndirirsiz?***

– Heydər Əliyev Fondu mədəniyyətimizin, o cümlədən muğamımızın ən böyük himayədarıdır. Mən bunu müsahibələrimdə, sənətlə bağlı söz düşəndə deməyi özümə borc bilirəm və deməliyəm. Bu diqqəti, qayğını qiymətləndirmək bütün muğam ifaçılarının borcudur. Allah Sabir Mirzəyevə rəhmət eləsin! Səhv etmirəmsə "Muğam" jurnalına müsahibəsində demişdi ki, muğamı reanimasiyadan xilas elədilər. Doğrudan da muğama maraq həddindən artıq azalmışdı. Yaşlı nəsil ruhdan düşmüşdü, gənc nəsil isə başqa istiqamətə gedirdi. Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun və Azərbaycan Mədəniyyət Fondunun prezidenti, Azərbaycan Respublikası Milli Məclisinin deputatı, UNESCO və ISESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyeva muğamı zirvəyə yüksəltdi, beynəlxalq aləmdə tanıtdı. Muğam sənətkarlarının nüfuzu qalxdı. Televiziyada muğam müsabi-

qələri başladı. Xalq artisti Əlibaba Məmmədov özü etiraf elədi ki, bizim 35 ilə gördüyümüz işi müsabiqələr 3 aya gördü. Bütün bunlar dövlətin, ölkə başçısının, Heydər Əliyev Fondunun xalqa, muğamsevərlərə misilsiz töhfələridir.

Televiziya muğam müsabiqəsində hər dəfə 16 dəqiqə yarım oxuyurdum. Bir az da danışığa yer verildiyini nəzərə alsaq təkcə mənim çıxışım 20 dəqiqəyə çatırdı. Bir dəfə Nadir Axundov müsabiqənin gedişində dedi ki, qohum-əqrəban kommersiya yolu ilə dövlət televiziyasına 260 mindən artıq pul ödəməliydi.

Sevindirici haldır ki, artıq muğam Avropanın məşhur salonlarından, okeanın o tayından, dünyanın hər yerindən eşidilir. Hal-hazırda ən gənc muğam ifaçısından tutmuş ən yaşlı sənətkarlarımızadək bir nəfər də qayğıdan kənarda qalmayıb. Bu qayğının qarşılığında bizim də əsas vəzifəmiz göstərilən etimadı doğrultmaq olmalıdır.

***– Xanəndələrimizə qəzəl ehtiyatlarının azlığını, söz bazalarının zəifliyini irad tuturlar. Siz necə düşünürsüz?***

– Qəzəl ehtiyatı məndə də azdı, başqalarında da. Hacı Mail bizi çox həvəsləndirmişdi. 100-ə qədər qəzəl əzbərləmişdim. Məhərrəm müəllim semestr müddətində 20 qəzəl əzbərləməyi tələb edirdi.

Etiraf edim ki, tay-tuşlarım , – içi mən qarışıq, – tənbəldir. Xanəndə daim öz üzərində işləməli, söz ehtiyatını zənginləşdirməlidir. Görünür, bu haqlı iraddan nəticə çıxarmağın vaxtı çatıb.

***– Söhbətimizin sonunda tamaşaçılara, dinləyicilərə nə deyərdiniz?***

– Deyərdim ki, mütləq zövqlü musiqiyə qulaq assınlar. Rok olsun, pop olsun, estrada mahnısı olsun, muğam olsun, fərq eləməz. Mahnı mətnlərinin səviyyəsinə diqqət yetirsinlər. Təkcə gündəlik musiqiləri dinləməklə zövqlərini korlamasınlar.

Sonda onu da deyim ki, musiqisi Tahir Əkbərə, sözləri Sona Vəliyevaya aid "Arazbari" adlı bir əsər üzərində işləyirəm. Ssenarisini Sabir Rüstəmxanlı yazıb. Özüm ifa etdiyimə görə demirəm, düşünürəm ki, yaxşı əsərdir və yüksək zövqlü tamaşaçılar üçün nəzərdə tutulub.

**Arif MƏMMƏDLİ**

## P.S. ƏVƏZİ

Dekabrın 7-də Beynəlxalq Muğam Mərkəzində tanınmış xanəndə Ehtiram Hüseynovun solo konserti baş tutub. Çoxsaylı muğamsevərlərin iştirakı ilə keçən konsert tamaşaçıların zövqünü oxşayıb. Konsert sonrası xanəndə fikirlərini **Modern.az** saytı ilə bölüşüb:

***– Ehtiram bəy, əvvəla təbrik edirik. Əhvalınız necədir?***

– Təşəkkür edirəm, minnətdaram təbrikiniz üçün. Çox həyəcanlı idim. Amma tamaşaçıların alqışları və dəstəyi mənə güc verdi. İlk dəfə idi solo konsert verirdim. Bu mənim tamaşaçılar və müəllimlərim qarşısında bir növ sınaq imtahanım idi. Bu imtahandan necə çıxdığımı onlar daha yaxşı bilirlər.

***– Yorulmadınız ki?***

– Qətiyyən! Bu cür tamaşaçı dəstəyi ilə saatlarla oxuya bilərəm. Ustad sənətkarlarımızın qarşısında çıxış eləmək çətin və məsuliyyətli olsa da hesab edirəm ki, öhdəsindən gəldim. İki saatdan çox bir müddətdə tamaşaçı səni dinləyib, alqışlayırsa yorulmaqdan söhbət gedə bilməz.

***– Yeni və maraqlı bir repertuar seçmişdiniz..***

– Əvvəla onu deyim ki, "Muğam Azərbaycanın milli sərvətidir", – deyən cənab prezident İlham Əliyevin dəstəyi, diqqət və qayğısı, "Biz muğamı gələcək nəsillərə qəlbimizin və ruhumuzun bir hissəsi kimi miras qoyuruq", – söyləyən Mehriban xanım Əliyevanın təşəbbüsləri nəticəsində muğam sənəti yeni inkişaf mərhələsini yaşayır və dünyada sevilir. Bu diqqət və qayğıya görə ölkə başçımıza, Mehriban xanıma dərin təşəkkürümü bildirirəm. Biz də çalışırıq ki, yaradılan bu şəraitdən istifadə edərək əlimizdən gələni edək. Uzun müddətdir ki, konsertə hazırlaşırdıq. 3-4 ay boyunca gərgin məşqlərimiz olub. Respublikamızın Əməkdar artisti tarzən Malik Mansurov başda olmaqla "Naz-nazı" ansamblının bütün üzvlərinə təşəkkür edirəm. Çox məsuliyyətli bir işin öhdəsindən layiqincə gəldilər. Çalışdıq ki, bir az fərqli yanaşma edək. Yenə də deyirəm, nə qədər uğurlu alındığını tamaşaçılar qiymətləndirəcək.

**Siyavuş ƏMİRLİ**

**ANIM**

## MƏHƏBBƏT KAZIMOVDAN BİR DAHA OLMAYACAQ...

Günlərin bir günü Məhəbbət müəllimə zəng etdim ki, proqrama çağırım. Razılaşdıq. Sonda mənə bir sual verdi... Soruşdu ki, "Mən üzr istəyirəm, heç maraqlanmadım. Sizin proqrama çıxmaq üçün mən nə qədər pul verməliyəm?" Dedim ki, "Məhəbbət müəllim, ayıb olar. Bu nə söhbətdi? Siz illərini sənətə, musiqiyə, xalqa bəxş etmiş insansınız. Rəvadırmı heç, sizi hansısa bir tənənna müqabilində proqrama çağıraq?" Tutuldu. Və bir daha təşəkkür etdi. O zaman anladım ki, salamı da təmənna ilə verən kommersiya dünyamızda

mediamız, televiziyalarımız səsi səsdən seçmir, təcrübəli, xalqın sevimli ifaçısı ilə təsadüfi oxuyanların arasında fərq qoymur. Çox məyus oldum.

Ertəsi gün, qonağım oldu. Dəhşətə gəldim... Hər zaman qədd-qaməti ilə göz oxşayan, şux və qala duruşlu Məhəbbət müəllim çox xəstə görünürdü. Əlləri əsir, çətinliklə addım atırdı. Yaxınlaşdım və halını soruşdum. Dedim ki, "Məhəbbət müəllim, halınız yaxşı deyilsə, bəlkə çəkilişi təxirə salaq. Yaxşı olanda gələrsiniz". Dedi ki, "Murad bala, sənin xətrini dünyalar qədər istəyirəm. Amma sonraya gümanım yoxdur. Mən bu gün səninçün oxumaq istəyirəm". Oxudu da... Ayaqdan qalxmayaraq... Bütün ölkə canlı efirdə xalqın Məhəbbətinin bu halını gördü... Hər kəs efirə zəng edir, sosial şəbəkələrdən yazır, sevgisini, ehtiramını söyləyirdi... Sağollaşarkən, "Murad bala, ömrümü uzatdın" söylədi...

Maraqlı bir faktdır ki, bizim məhz bu görüşümüzdən sonra Məhəbbət Kazımovu digər həmkarlarım axtardılar və reytinq üçün onu çox aktiv şəkildə dəvət etdilər. Bəlkə də sappasağlam olsaydı, bunu təmənnasız etməzdilər. Amma indi sensasiya var idi axı... Nə deyim? Görünür, günümüzün reallığı budur ki, mediamıza insan ölüm ayağında, ya da öləndən sonra daha maraqlı olur.

Bu görüşümüzün üstündən daha 1 il də keçdi. Məhəbbət müəllimi bir daha dəvət etdim. Bu dəfə ovqatı və halı xeyli düzəlmişdi... Çox sevindim və sevincimi hiss edən Məhəbbət müəllim belə dedi: "Murad bala, sən çox gözəl və sənətçi ürəyi daşıyan, həssas bir insansan. Allah səndən razı olsun. Bu gün sizdən bir xahişim var. Hiss edirəm ki, artıq sonuncu görüşümdür. İllər öncə bir "Mirzə Hüseyn" segahı yazdırmışam. 20 dəqiqəlik "zapis"dir. Qoy onu bu gün oxuyum. Xalqım bilsin ki, Məhəbbət xanəndə idi, muğamı bilirdi, muğama bağlı idi..." Təbii ki, verilişin efir imkanları buna yol verməsə də, sırf Məhəbbət müəllimə bu imkanı yaratdıq... Ayrılanda dedim ki, "Məhəbbət müəllim, artıq yaxşılaşmağa doğru gedirsiniz. Pis fikirləri qovun. Hələ çox görüşəcəyik"... Proqramı təqdim edəndən 3 gün sonra onun ölüm xəbərini eşitdim... O an ilk düşündüyüm nədənsə oxuduğu "Mirzə Hüseyn" segahı oldu...



Xalqı, Vətəni, insanları, sənəti və Laçınını Məhəbbət kimi sevən sənətçilər az-az dünyaya gəlir.. Təəssüf ki, itirdikdən sonra anlayırsan ki, Məhəbbət Kazımovdan bir daha olmayacaq...

**Murad ARİF**

**BİZƏ YAZIRLAR**

# KÖÇKÜNLÜK ŞƏRAİTİNDƏ 20 İL

Bu il Bakının Xəzər rayonunun Mərdəkan qəsəbəsindəki Avtomobilçi düşərgəsində fəaliyyət göstərən Laçın rayon 31 №-li tam orta məktəbin köçkünlük şəraitində fəaliyyətinin 20 ili tamam olur. Bu günlərdə məktəbin 20 illik yubileyi ilə bağlı müəllim və şagird kollektivinin iştirakı ilə tədbir keçirilmişdir. Tədbiri giriş sözü ilə məktəbin direktoru Azər Cabbarov açaraq 20 illik fəaliyyəti dövründə məktəbin uğurlarından, məktəbin düşərgədə, eləcə də ətraf ərazilərdə məskunlaşmış məcburi köçkün övladlarının təhsil almalarında müstəsna əhəmiyyətindən danışdı. Ötən müddət ərzində təhsil sahəsində aparılan islahatlar, bu islahatların həyata keçirilməsi məqsədi ilə görülən işlər haqqında ətraflı məlumat verən məktəb rəhbəri böyüməkdə olan gənc nəslin hərbi-vətənpərvərlik tərbiyəsinə xüsusi diqqət göstərildiyini də qeyd etdi. Sonra A.Cabbarov çıxışında Azərbaycan elminin, təhsilinin, mədəniyyətinin, idmanının və digər sahələrin inkişafında göstərilən qayğıya görə prezidentimiz cənab İlham Əliyevə, Heydər Əliyev Fondunun rəhbəri, millət vəkili Mehriban xanım Əliyevaya və eləcə də Laçın Rayon İcra Hakimiyyətinin başçısı cənab Akif Səlimova tədbir iştirakçıları adından minnətdarlığını bildirdi, bundan sonra da məktəbin işgüzar kollektivinin fəaliyyətinin gənc nəslin yetişməsi, milli vətənpərvərlik ruhunda təhsil və tərbiyə almaları üçün var qüvvəsini əsirgəməyəcəyini bildirdi. Sonra A.Cabbarov 2013-2014-cü tədris ilində məktəbin məzunlarından Vəlixanova Çinarə Elşən qızının Azərbaycan Dövlət İqtisad Universitetinə, Baxşəliyev Kənan Habil oğlunun Azərbaycan Dövlət Neft Akademiyasına, Hacızadə Orxan Elşən oğlunun isə Azərbaycan Kooperasiya Universitetinə, eləcə də 2 nəfər şagirdin dövlət orta ixtisas məktəblərinə qəbul edildiyini vurğuladı.

Builki tədris ilinə də uğurla başlanıldığı haqqında danışan məktəbin direktoru 31 oktyabrda yeniyetmələr arasında keçirilən bilik yarışmasının IV Azərbaycan çempionatının seçim turunda iştirak etmiş şagirdləri – Vəlixanov Elşad, Cabbarlı Xəzər, Cabbarlı Rəşad, Həsənzadə Aytac və Ələkbərova Səbinəni, eyni zamanda kollektivin bütün üzvlərini bu yarışmada I yer tutmaları münasibəti ilə təbrik etmiş, onlara Azərbaycan Gənclər və İdman Nazirliyi, Laçın Rayon Gənclər və İdman İdarəsi, məktəb rəhbərliyi adından diplom və hədiyyələri çatdırmışdır.

Sonra məktəbin təlim-tərbiyə işləri üzrə direktor müavini Faiq Heydərov çıxış edərək Azərbaycan Respublikasının iqtisadi cəhətdən günü-gündən güclləndiyini, Silahlı Qüvvələrin hər an işğal altında qalan torpaqları

azad etməyə qadir olduğunu bildirdi. Böyüməkdə olan gənc nəslin təlim-tərbiyəsində orta məktəbin qabaqcıl təhsil müəssisələrindən olduğunu, bu təhsil ocağının tezliklə doğma Laçınımızda fəaliyyətini davam etdirəcəyinə əmin olduğunu söylədi.



Çıxış edən şagirdlər isə təhsilə böyük məsuliyyətlə yanaşacaqlarını, yüksək nəticələr göstərərək ali məktəblərə qəbul olunacaqlarını, dövlətə, Vətənə sədaqətlə xidmət edəcəklərini və işğal altında qalan torpaqların azad olunmasına var qüvvələri ilə çalışacaqlarını bildirdilər.

Tədbirdə məktəbdə şagirdlərin təlim-tərbiyəsi ilə məşğul olan müəllimlərdən Hüseynova Südabə, Quliyeva Təbibə, Qurbanova Vüsalə, Pəniyeva Leyla və başqalarının adları qabaqcıl müəllimlər sırasında çəkildi və onlara göstərdikləri fəaliyyətə görə təşəkkür edildi, gələcək işlərində uğurlar arzulandı. Məktəbdə pedaqoji prosesin təşkilinə rəhbərlik edən məktəb rəhbərlərinə, o cümlədən direktor müavinləri Faiq Heydərova, Pərviz Məmmədova, məktəbin psixoloqu Günay İsgəndərovaya, Uşaq Birliyi Rəhbəri İradə Ələsgərovaya çətin şəraitdə məcburi köçkün övladlarının təhsil alması üçün çəkdikləri ağır zəhmətə görə valideynlər adından minnətdarlıq bildirildi.

Məktəblər arasında keçirilən "Xəmsə" intellektual yarışmasına qatılan məktəbin "Reksas" komandası Laçın rayon məktəbləri arasında birinci yerə çıxmağı bacarıb. Bununla da zona turuna vəsiqə qazanan təmsilçilərimiz Qarabağ zonasında Laçın rayonunu təmsil ediblər. Bu turda da rayonumuzu və məktəbimizi layiqincə təmsil edən "Reksas" komandası Qarabağ zonası üzrə də birinci yerə çıxaraq, Qusarda keçirilən "Xəmsə" intellektual oyununun Respublika mərhələsinə vəsiqə qazandı. Dekabrın 5-7-də keçirilən "Xəmsə" intellektual oyununun yeniyetmələr arasında IV Azərbaycan çempionatının final mərhələsində məktəbin "Reksas" komandası uğurla cıxış edərək, rayon tarixində ilk dəfə olaraq 820 komandanın qatıldığı yarışmada 10-cu yerə çıxmışdır.

Tədbirdə şagirdlər müstəqilliyimizə, işğal altında olan ərazilərimizə, Laçına aid şeirlər söylədilər. Gənc müəllimlərdən Hüseynova Təzəgül, Hidayətzadə Aysel və başqaları da çıxış edərək ümid etdiklərini bildirdilər ki, ümummilli lider Heydər Əliyevin layiqli davamçısı İlham Əliyevin apardığı uğurlu daxili və xarici siyasətin nəticəsi olaraq tezliklə işğal altında olan torpaqlarımız işğaldan azad olacaq və biz doğma Laçınımıza qayıdaraq bu müqəddəs işi orada davam etdirəcəyik.

**Faiq HEYDƏROV**

**ANIM**

# O, VƏTƏN, TORPAQ XƏSTƏSİ İDİ




Oxuduğu mahnıları, muğamları, adı dillər əzbəri olan xalqımızın sevimli müğənnisi Məhəbbət Kazımovun xəstələnməsi xəbərinin yayılması və 27 yanvar 2014-cü il tarixdə vəfat etməsi hər kəsi sarsıtdı. Heç kim dağ vüqarlı sənətkarın ayaqüstü keçirdiyi müəmmalı xəstəlikdən ölümü ilə barışa bilmir. Allah rəhmət etsin sevimli sənətkarımıza, onun çoxdan xəstə olduğu mənə məlum idi, özünün oxuduğu kimi, qalmışdı göylə yer arasında.

1997-1998-ci illər idi. Bakıda Şuşa kinoteatrında hər bazar günü keçirilən “Xoş gəldin” verilişi çox populyarlıq qazanmışdı. Respublikamızın incəsənət adamları ardıcıl olaraq bu verilişə əvvəlcə qonaq kimi dəvət alır, növbəti verilişdə isə ev yiyəsi kimi, bu verilişə öz qonağını dəvət edərdilər. Sənət adamları üçün bu veriliş əsl sınaq meydanına çevrilmişdi. Sənətkarlarımız bu meydanda canlı olaraq öz sənətlərini nümayiş etdirirdilər. O dövrdə bu verilişi ölkəmizdə, demək olar ki, hər kəs izləyirdi. Bir gün də sıra sevimli sənətkarımız Məhəbbət Kazımova yetişdi. Onu qonaq kimi adını unutduğum bir aktrisa dəvət etmişdi. Bu dəvətə tanıdığım hər kəs sevinir, səbirsizliklə həmin verilişi gözləyirdilər. Möcüzəli səsi, dağ çayıtək çağlayan zənguləsi, bulaq suyu kimi pıçıldayan pəsi olan bu müğənnini görmək, vətən həsrətli ifalarını canlı-canlı dinləmək istəyi məni Bakıya – Şuşa kinoteatrına gətirdi. Həftənin əvvəlində gəlməyimə baxmayaraq, ön sıralara bilet tapa bilmədim.

Nəhayət, səbirsizliklə gözlədiyimiz gün gəlib yetişdi, ailəlikcə gəldik Şuşa kinoteatrının önünə. Burada böyük bir izdihamla qarşılaşdıq, bilet ala bilməyən adamların arasından içəri keçmək çox çətin idi. Biz çətinliklə içəri keçdik, veriliş başlayana yaxın bütün bilet ala bilməyən adamları da içəri buraxdılar. Bütün cərgələrin araları, keçid yerləri də ayaq üstə dayanan adamlarla dolmuşdu. Daxil ola bilməyənlər bayırda qaldılar. Nəhayət, gözlədiyimiz an yetişdi, sevimli sənətkarımız öz duet ortağı olan Könül Kərimova ilə birlikdə səhnəyə çıxdı. Bir azdan Məhəbbətin vətən həsrətli, yanıqlı səsinin sehrinə düşdük.

Bu il yenə gedəmmədim
Bizim dağlara, dağlara.
Görən gedib çatacaqmı
Ahım dağlara, dağlara?

Atım yoxdu yəhərlənə,
Dəli könlüm qəhərlənə.
Yönüm düşüb şəhərlərə,
İzim dağlara, dağlara.

Mən o yerin oğluyam,
Bəy Sultanın övladıyam.
Qəbirdə də yatasıyam,
Yönü dağlara, dağlara...

Zalda hamını qəhər boğmuşdu, çoxları göz yaşına hakim ola bilmir, hönkürüb ağlayanlar da olurdu. Budur növbəti ifa:

...Bir bahara əl uzatdım, bir qışa,
Bir səhraya qəfil düşən yağışa,
Qayıt dedim, qayıt dedim, qayıtmadı...

Sənətkarımız Könül xanımla duet oxuyanda hamının eyni açıldı. Məhəbbət doğrudan da çox uğurlu bir duet ortağı seçmişdi. Həm səs uyğunluğu, həm də boy-buxun yaraşığı bu ifaçılarda bir-birini tamamlayırdı.

Ürəkdə arzu-dilək,
Sevginin qədrin bilək.
Cənnətdən uçan mələk,
Bir dənəsən, bir dənə...

İfalararası Məhəbbət müəllimə sual verdilər ki, Könül xanımla tanışlıqları necə olub? O isə dedi: “Bir sənət dostum (adını da dedi, unutmuşam) mənə bir gün dedi ki: “Bir qız var, yaman oxuyur, elə belə də dedi. Dəvət etdim, oxumağı, səsi xoşuma gəldi”.

Budur, Məhəbbətdən yenə bir ifa:

Səndən mənə bir ömürlük xatirə,
Məndən sənə nə qalacaq, bilmirəm.
Çətin bir də daş üstə daş bitirəm,
Niyə uçdu bu qalaçıq, bilmirəm.

Günlər mənə gün yazmağı unutdu,
Gülüm, günüm güllərimi qurutdu.
Bu sevdada kim uduzdu, kim uddu,
Peşimanı kim olacaq bilmirəm...

Nəhayət, Məhəbbət möhtəşəm "Laçınım" mahnısını oxuyanda gözlərdən yaşlar süzülür, vətən həsrətli dinləyicilərin hamısı ağlayırdı.

Elə ifa yenicə bitmişdi ki, səhnəyə bir adam çıxdı. Mən onu tanıdım, vaxtı ilə Laçın Rayon Şəlvə Kənd Xəstəxanasında baş həkim işləmiş Qurbanəliyev Vaqif Qaçay oğlu idi. Onunla Sumqayıtın Hacı Zeynalabdin Tağıyev qəsəbəsində bir binada, bir blokda qalırdıq, lakin bura gələndə bir-birimizdən xəbərimiz olmayıb. Yeri gəlmişkən onu da bildirim ki, Vaqif həkim köçkünlüyün ilk illərində bizə təmənnasız çox tibbi xidmət göstərmişdi. Hətta o dövrdə onun xidmətlərini belə tərənnüm etmişdim:

Axtardım evində tapmadım səni,
Söylə, harda idin bütün gecəni?
Həyata qaytardın neçə körpəni,
El-oba yolunda solansan həkim,
Min bir dərman bilən Loğmansan, həkim.

Vaqif həkim Məhəbbət Kazımova bir yazılı vərəq təqdim etdi. Məhəbbət isə təklif etdi ki, yazısını özü oxusun. Vaqif də oxudu. Bu, bir xəstəyə yazdığı resept imiş. Reseptdə yazılmışdı:

*Xəstə – Məhəbbət Kazımov*
*Diaqnoz – Vətən, torpaq həsrəti*
*Dərman – Vətən, Vətən torpağı*

Sonra Vaqif həkim ona ovcunda salafana bükülmüş nəsə verdi və dedi ki, Laçın torpağıdı, köçərkən atamın məzarı üzərindən gütürmüşəm, indi bir ovuc sənə verirəm ki, vətən torpağını qoxlayasan, bəlkə müvəqqəti də olsa dərdinə dərman ola. Lakin ilk dəfə olaraq Vaqif həkimin dərmanının əks təsirini gördüm. Məhəbbət Kazımov çox mütəəssir oldu, ayaq üstə dayana bilməyib oturdu, ona su gətirdilər, bir müddətdən sonra özünə gəldi. Növbəti ifalar Könül xanımdan gəldi.

Məhəbbət bir qədər toxdayandan sonra Naxçıvandan – Batabatdan Laçın dağlarına baxarkən oxuduğu mahnını oxudu. İlahi, nə qədər möhtəşəm ifa:

Yenə gördüm gördüyümüz dağları,
Nəfəsindən əriyirdi dağ qarı.
Yenə, yenə durnaların qatarı,
Dünya həmən, dünya həmən dünyadı...

“Xoş gəldin” verilişinin ənənələrinə görə, ifalararası tamaşaçılar ifaçılara suallar verərdilər, verilişin sonunda isə, sənətçilər ən çox xoşları gələn sualların müəlliflərini mükafatlandırırdılar. Bu verilişin sonunda isə Məhəbbət Kazımov dedi : “Heç kim inciməsin, dədəmin goru haqqı bütün mükafatları – kasetləri Vaqif həkimə verəcəyəm”. Elə dediyi kimi də etdi. Bax beləcə məhəbbət dolu, həsrət dolu Məhəbbətlə unudulmaz, nəğməli anlar yaşadıq.

Bulaq kimi qaynayan,
Dağ çayıtək çağlayan,
Şəlalətək hayqıran,
Məhəbbət də ölərmiş?!

Yaman oldu səbirsiz,
Haray çəkdi vətənsiz.
Hörmət, şöhrət sərhədsiz,
Məhəbbət də ölərmiş?!

“Laçınım”la çəkdi haray,
Qəlbimizdə qurdu saray,
Nalə edən: “bay! bay!!, baaay!!!”
Yanan şamtək sönərmiş,
Məhəbbət də ölərmiş!!!

Yaşayacaq qəlbimizdə,
Obalarda, elimizdə,
Adı əzbər dilimizdə,
Ürəklərdə gəzərmiş,
Məhəbbət də ölərmiş?



**Dilafət RƏSULOV**

**POEZİYA**

**Məhəmməd ƏLİ**



## BU DAĞLARIN

Bu dağların zirvəsi ağ qar,
Ətəyi yamyaşıl meşədir.
Qayaları sirli bir aləm,
Dərələri cənnət guşədir.

Bu dağların başı ağ bulud,
Yal-yamacı çiçək, lalədir.
Sərvi qayası qıza bənzər,
Hörükləri gur şəlalədir.

## EŞQİN ZİRVƏSİ

Hər şeyin zirvəsi olantək,
Eşqin də zirvəsi var.
Onun əlçatmaz zirvəsində
Tanrı tutubdur qərar.
Kim anlayır bu həqiqəti
O, daim ucalacaq.
Bunu dananlarınsa,
Yeri cəhənnəmdir ancaq.

## QONAĞIM GƏLİR

Qapım ərklə bərk-bərk döyüldü,
Sandım tanış qonağım gəldi.
Bu ki can sirdaşım dərdimdir,
Qol açıb oynamağım gəldi.

## BU GECƏ

Bu gecə
Ala-toran buludlardan
Göy üzünə tül çəkib.
Bu gecə
Yolçular azmasın deyə
Səmada ulduzlardan
Yol çəkib.
Bu gecə gözüyuxulu,
Gözü meyxoşdur.
Sanki qovuşub sevgilisinə,
Vüsal dəmindən sərxoşdur.
Bu gecə sakit gecə,
Səs-səmirsiz gecə,
Küçələrdə heç kim görsənmir,
Küçələri kimsəsiz gecə.
Bu gecə
Hamı çəkilib öz otağına.
Bu gecə
Sakit-sakit uyuyur
Girib yatağına.

XALQ QƏHRƏMANLARI



## AZƏRBAYCAN XALQININ QƏHRƏMAN OĞLU – SULTAN BƏY

Azərbaycan xalqının tarix boyu başına çox hadisələr gəlmiş, uzun müddət yadellilərin işğalına məruz qalmışdı. Həmişə də bu sınaqlardan üzüağ çıxmış və düşmənlərə qalib gələrək, vətəni düşmən tapdağından xilas etmişdi. Cavidan, Babək və son dövrlərdə Vətən uğrunda qəhrəmanlıqla şəhid olan Rza, Natiq, Namiq, Mahmud, Vaqif, Salatın, Mübariz kimi Milli Qəhrəmanlarımız var.

Mən indi sizi XIX əsrin sonları, XX əsrin əvvəllərində Azərbaycanın qərbində yerləşən Laçın rayonunda yaşamış Sultan bəy adlı bir qəhrəmanla tanış etmək istəyirəm. Bu, 1871-ci ildə Zəngəzur qəzasının Hacısamlı nahiyəsinin Qasımuşağı obasında (indiki Laçın rayonunun Kürdhacı kəndində) anadan olmuş Sultanov Sultan Əlpaşa bəy oğludur (kənd içində ona Paşa deyirdilər). Muradov Əlpaşanın (onu da bir daha nəzərinizə çatdıraq ki, bir çox mənbələrdə Sultan bəy Muradov soyadını daşıyır) Sultan bəy, Xosrov bəy, İsgəndər bəy, Rüstəm bəy, Bahadur bəy, İsrafil bəy, Zülü bəy adlı yeddi oğlu və Aftab xanım, Ziba xanım, Məhbub xanım adlı qızları olmuşdur.

Paşa bəy Sultan və Xosrov bəyin tərbiyəsinə xüsusi fikir vermiş, onların bir şəxsiyyət kimi yetişməsinin qayğısına qalmışdır. Odur ki, Sultan bəyi hərb sənətinə, Xosrov bəyi isə tibb elminə yiyələndirmişdir.

Rusiyada hərbi təhsilini başa vurduqdan sonra Sultan bəy Rusiyada qalıb rus ordusuna xidmət etməkdənsə, öz el-obası olan Laçın rayonunun Kürdhacı kəndinə qayıdaraq xalqın ağır güzəranını yaxşılaşdırmağı özünə borc bilmişdir.

Sultan bəyin bir milli qəhrəman kimi yetişməsi 1905-ci və 1918-ci illər Azərbaycan-Ermənistan münaqişələri ilə bağlı olmuşdur. Erməni daşnakları tərəfindən xalqının başına açılan müsibətlər onu bir vətən oğlu kimi narahat

edir. O, silaha sarılaraq Vətəninin müdafiəsinə qalxır. Ətrafına çoxlu igidlər toplayaraq döyüş meydanına atılır.

XX əsrin birinci onilliyində türk ordusu tərəfindən qulağı kəsilmiş Andranik qaçıb İrəvana gəlmişdi. O, İrəvanda başına quldur dəstələri toplayaraq Zəngəzur mahalına hücumlar edir və bir çox vəhşiliklər törədirdi.

Andranikin rəhbərliyi ilə erməni daşnak birləşmələri Azərbaycan uşaqlarını tonqallarda yandırır, onların başlarına mismar çalırdılar. Hələ bu vəhşiliklər az imiş kimi, hamilə qadınların qarnına xəncər soxur, qadınların kürəklərinə xaç şəkli çəkir və eyni zamanda insanların ayaqlarına nal vururdular. İnsanların kürəklərinə qaynaya-qaynaya samovarlar bağlayır və bundan sanki həzz alırdılar.

Beləliklə, erməni daşnakları viran etdikləri kəndlərdən əldə etdikləri qənimətlərlə özlərinə nizami ordu yaradırdılar. Onlar Laçın rayonunun bir çox kəndlərinə, o cümlədən Zabux və Tat kəndlərinə hücum edərək, həmin kəndləri dağıdıb, xaraba qoyurdular.

Sultan bəy insanların başına oyun açan, kəndləri dağıdıb viranə qoyan erməni daşnaklarını yerlərində oturtmağa gəlir. İrəvandan Şuşaya gedən Andranikə Şuşadan Qaladərəsinə gedən yolda, Yeddiqatın ayağında pusqu qurur. Andranikin silahla yüklənmiş 170 qatır karvanı burada darmadağın edilərək, bütün silahları ələ keçirirlər.

Tarixdə erməni daşnaklarına dərs olsun deyə Sultan bəy düşmən ordusunun otuz min əsgərini quzğunlara yem edir, altmış bir sərkərdəsinin başını kəsərək Hacısamlı meşəsindəki şirlərə atdırır. Andranikin quduz ordusunun Zabux dərəsindəki darmadağın edilməsindən sonra rayonun kəndlərində böyük ruh yüksəkliyi yaranır. Hər tərəfdən Sultan bəyin dəstəsinə çoxlu igidlər qoşulur və onlar da kəndlərin müdafiəsinə qalxırlar. Onun başçılığı ilə "Dağlarda tufan", "Güllə ətdən keçib, ətdə soyumalı", "Zərbə dalınca zərbə", "Nal şəkilli mühasirə", "Üçbucaq", "Qəflətən hücum", "Güllədən leysan", "Mövqe seçmək bacarığı" kimi hərbi taktikalardan istifadə edilmişdir. Bu taktikaların hər birində də bəyin ordusu qalib gələrək, düşmənləri yerlə-yeksan etmişdir.

1917-ci ilin may ayının 10-u idi. Hər tərəf yaşıllaşmış, yazın gözəl təravəti hər tərəfdə duyulurdu. Belə bir gözəl gündə Sultan bəyin ordusu Qaragöl döyüşünə hazırlaşırdı. Planlaşdırılmış şəkildə hazırlanan döyüş zamanı nişanlanmış topların mərmiləri düşdüyü yerdə daşnakları torpaqla birlikdə göyə sovururdular. Hansı səmtə üz tutsalar da, güllə yağış kimi onların başına yağırdı.

Qaragöl döyüşündə 9 uzaqvuran, 5 yaxınvuran topdan, 40 pulemyotdan, 3 min müxtəlif növ tüfəngdən, 120 qılıncdan, 9 mindən artıq canlı qüvvədən istifadə olunmuşdu. Qaragöldə qazanılan qalibiyyətin əks-sədası hər tərəfə yayıldı. Qaragöldən çıxan ordu döyüş meydanından Gorusa doğru hərəkət etdi. Sultan bəyin rəhbərlik etdiyi ordu qısa vaxt ərzində Minkənd ilə Xınzirək kəndlərini də mühasirəyə alaraq, oradakı ermənilərin hamısını qırdılar.

Bəyin bu qəfil zərbələrinə tab gətirməyən erməni daşnakları Araz çayı ilə İrana keçmək istəyirdilər. Ancaq yenə də Həkəri və Bərgüşad çaylarının vadilərində yerləşən kənd camaatı onların İrana keçməsinə mane oldu. Sultan bəyin ordusu ilə birləşərək erməniləri qırmağa başladılar və bəyin rəhbərliyi ilə ermənilərin bütün var-dövlətləri azərbaycanlı kəndlilərə paylandı.

Araz çayını keçənlərin arasında Andranik də var idi. Tələyə düşdüyünü görən Andranik yaltaqlanmağa başlayır və bəyə deyir: “Ay bəy, Allah daşnakların evini yıxsın, nahaq yerə xalqımızı qırğına verdilər”. Sultan bəy soruşur ki, “bəs sən haradan gəlirsən?” O, isə cavabında deyir ki, “bu uşaqlar yaxın kənddən atalarının dalınca gəliblər, ataları isə Zabux vuruşmasında ölüb. Dedim aparıb ötürüm, qurd-quşa yem olarlar”.

Neçə gündü aldığı qələbə xəbərlərindən sevinən bəy ayaqlarını aralı qoyaraq deyir:”gəl keç”. Andranik isə onun ayaqlarının arasından keçərək oradan uzaqlaşır. Bir azdan gələn atlılar Andranikin iki uşaqla qaçdığını deyir. Sultan bəy isə heç kefini pozmadan deyir ki, “Oğul-oğul, getməyin, onun qulağını türklər kəsmiş, mənimsə qılçamın arasından keçmişdir. O, Azərbaycana heç nə eləyə bilməz”.



Bizim bugünkü günümüzdə də, Azərbaycan torpaqlarının 20 faizdən çoxunun işğal olunduğu bir vaxtda, Sultan bəy kimi cəsur, igid, qəhrəman oğullar bizə çox lazımdır ki, işğal altında olan 11 rayonumuzu- Xocalı, Şuşa, Laçın, Xocavənd, Kəlbəcər, Ağdərə, Ağdam, Cəbrayıl, Füzuli, Qubadlı, Zəngilan rayonlarını işğalçı erməni daşnaklarından təmizləsin.

**Məlahət AĞAYEVA,**
***sənətşünaslıq üzrə fəlsəfə doktoru***

**POEZİYA**

**Ötərxan ELTAC**



## LAÇIN HARAYLAYIR LAÇINA BİZİ

Kələk ayaq tutdu, yeridi yalan,
Qoymadı zirvədə yaşayam, qalam.
Deyəsən torpağı satdılar, balam –
Axır döndərdilər qaçqına bizi,
Laçın haraylayır Laçına bizi.

Kəklikli qayalar dinmir, lal olub
Coşqun şəlalər coşmur, sal olub.
Doğma Quşçu kəndim bir xəyal olub,
Yandırıb erməni xaçına bizi,
Laçın haraylayır Laçına bizi.

Min il tarixim var Qızıl qayada
Düşmənim atlıdı, mənsə piyada.
Torpağı satanlar qalıb arxada –
Əritmə kiminsə suçuna bizi,
Laçın haraylayır Laçına bizi.

Bürüyüb dağları inilti səsi,
Əsir qardaşların ahı, naləsi.
Tuş etdi Hoçazda Laçın həvəsi –
Şəhidin qoluna, qıçına bizi,
Laçın haraylayır Laçına bizi.

Naləsi yamandır uca göylərin,
Qeyrəti yol verməz igidin, ərin.
Allah bağışlamaz qız-gəlinlərin
Yad ələ dolaşan saçına bizi,
Laçın haraylayır Laçına bizi.

Yalnız torpağımdır babamdan miras,
Ac qalıb əynimə geymərəm libas.
Ər kişi işidir qisasa qisas,
Bənzədin dağların qoçuna bizi,
Laçın haraylayır Laçına bizi.

## MUĞAYAT OLUN

Sizə bir ricam var, ay Səlim həkim,
Didərgin Ənvərdən muğayat olun.
Şair eli üçün bir qibləgahdı,
Qibləgahdan, pirdən muğayat olun.

Daim dalğalana Ənvər harayı,
Qoymayın sökülə könül sarayı.
Şairin ürəyi Tanrının payı,
O ləli-gövhərdən muğayat olun.

Ənvərin qəlbində vətən dərdi var,
Ahından göy titrər, yer parçalanar.
Haqqını tanıyan haqqa calanar,
Haqqı-mötəbərdən muğayat olun.

Kaş perik düşməyə dağlar qarından,
Şair vətənindən, ağac barından.
Saz-söz ustadından, xiridarından,
Möcüzi-zərgərdən muğayat olun.

Ötərxan möhtacdı bu yalvarışa,
Kaş ki, harayıma Tanrı qarışa.
Ənvər də kürsüdə coşa, danışa,
Didərgin Ənvərdən muğayat olun.

## QOXUSU GƏLƏ

Sacın külsüz qalıb sönmüş ocaqda,
Xəmir də mayasız donub bucaqda.
Aldığım ərzağın hamısı saxta,
Süfrəyə nənəmin yuxası gələ.

Yaxasan çörəyə süd qaymağını,
Motal pendirini, kərə yağını.
Yalayıb durasan dil-dodağını,
Burnuna təndirin qoxusu gələ.

Gələ hərarəti çiçəkli qarın,
Əkdiyin ağacın yığasan barın.
Lilpar bulaqların, şırşır çayların,
Şaqraq bülbüllərin oxusu gələ.

Dağlar gözəli bil altıncı ayı,
Keçir zirvələrdə baharı, yayı.
Bacarıb olasan elin harayı,
Ardınca elinin çoxusu gələ.

Gül-çiçəklər puçur-puçur şehlənə,
Nəğməsinə qulaqların şəklənə.
Telli sazın "Ruhani"yə köklənə,
Nakam gözlərinin yuxusu gələ.

Ötərxan Eltacam, qulağım səsdə,
Harayım nalədi, səsim ahəstə.
Geniş məclis quram göy çəmən üstə,
Sərməyə dədəmin çuxası gələ.

## QADAN ALIM

Zirvəyəm, köksümə duman çökməmiş,
Küləklər telimə sığal çəkməmiş.
Sübhün şəfəqləri məni öpməmiş,
Özün qucaqlayıb öp, qadan alım.

Silindi qəlbimdən daha kədər, qəm,
Səni görən gündən o qədər şənəm.
Yad nəfəs dəyməyib, büllur çəmənəm,
Məhəbbət toxumu səp, qadan alım.

Bir sevda yolunda canıma qıydım,
Sevgi-məhəbbətin dadını duydum.
Yaxşı ki, yada yox, mən sənə uydum,
Yandım atəşinə lap, qadan alım.

Qızmar bir günəşəm, soyuq bir daşam,
Elə fikirləşmə qanadsız quşam.
Çaldığın havaya çox oynamışam,
Oynaya bilmirəm rep, qadan alım.

## BAĞIŞLA, ƏZİZİM

Bilirəm nurunu itirməyibdi,
Yolumu gözləyən göz o gözdüsə.
Bilirəm yad üzə sürtülməyibdi,
Üzümə sürtülən üz o üzdüsə.

Qəlbimdə yarasan o vaxtdan bəri,
Uçurum yollardan dönmərəm geri.
Küsmərəm, sinəmdə daim gəz, yeri,
Cığır o cığırsa, iz o izdisə.

Yenə də məğrursan, üzdə təravət,
Qəlbimə hakimsən, ey gözəl afət.
Olammaz içimdə zərrə xəyanət,
Baxış o baxışsa, göz o gözdüsə.

Yenə də saçların rəngi xurmayı,
Baxışın lal edib günəşi, ayı.
Yenə olacaqsan könlüm sarayı,
Vədə o vədəsə, söz o sözdüsə.

Yenə o yolları bir gedəcəyik,
Qaçassan, qovacam, ötüşəcəyik.
Yenə qucaqlaşıb öpüşəcəyik,
Dizimə toxunan diz o dizdisə.

Bir ömür yaşadıq baharla, qışla,
Canından qadanı qəlbimə tuşla.
Bağışla, əzizim, məni bağışla,
Yazdığım misralar səni əzdisə.

**MÜƏLLİM ÖMRÜ**

## ZÜLMƏTİ YARAN NUR

Həyatda elə dəyərlər vardır ki, onlar haqda danışarkən söz tapmağa çətinlik çəkərsən. Bu çətinlik sözün azlığından deyil, əksinə, deyiləcək o qədər söz olar ki, haradan başlamaq lazım olduğunu bilməzsən.



Mənim üçün müəllimlik həmin dəyərlərin biridir. Müəllim... Ən azı Vətən qədər müqəddəs varlıq... qələm tutmaqdan gözəl əsərlər ərsəyə gətirməyə qədər bizə himayədarlıq göstərən insan... Şərəfli, ləyaqətli bir peşə sahibi... Şairi də, rəssamı da, memarı da, elə müəllimin özünü də yetişdirən müəllim... Ədalətlə, qanunla yerinə yetirilən bütün peşələr müqəddəs hesab edilir. Amma o peşə sahiblərinin özlərinin də bir müəllimi olması bütün bu müqəddəslərin, gözəlliklərin önündə gəlir. Səbirsizliklə birincilərin yolunu gözləyən, onları doğma balalarıtək bağrına basan, onlara o kiçik barmaqlarında necə qələm tutmağı yüksək səbir ilə öyrədən ibtidai sinif müəllimlərindən tutmuş, ayrı-ayrı elm və fənlərə, xarici dillərə yiyələndirən fənn müəllimlərinə qədər bütün müəllimlər canını, həyatını, gəncliyini gül balaların maariflənməsinə, Vətən üçün xeyirli övlad olmasına, dilinə, dininə, millətinə sadiq olmasına sərf edirlər. Müəllim üçün həyatın mənası şagirdlərinin uğurlarını, nailliyyətlərini görmək, onların biliklərə yiyələndiyinə, cəmiyyətə yararlı bir fərd kimi yetişməsinə nail olmaqdır. Müəllim şagirdin təkcə biliyinə deyil, eyni zamanda onun yaşadığı dövrün tələblərinə, müəyyən problemlərə, onları həll etmə tərzinə, pis alışqanlıqlardan uzaq bir fərd kimi formalaşmasına, bir sözlə, dərsə aid olan və olmayan hər bir məsələyə bir valideyntək can yandırır. Müəllim zülməti yaran nurdur. O elmin qılıncı ilə cəhaləti yox edən, sevməyi sevən, nifrətə nifrət edən, ciddiyyəti ilə seçilən, ideallığa doğru gedən, lakin yerişini heç zaman dəyişməyən şəxsiyyətdir.

Məncə, anadan sonra məhz müəllim yer üzünün fədaisidir. Deyirlər, insan qarşısına qoyduğu bütün məqsədlərə nail olmaq iqtidarındadır. Adi bir palçıqdan gözəl bir sənət əsəri yaradan da, kiçik bir kətan parçasını əsrarəngiz bir rəsm əsərinə çevirən də, kiçik bir alətdən könül oxşayan musiqi səsləndirən də, heç yaşanmamış bir hekayəni canlandırıb hər kəsi ağlatmağı bacaran da məhz insandır... Amma bütün bu işlərdə insanın ehtiyacı olan yeganə varlıq sözsüz ki, müəllimdir! Bəli, məhz müəllim şagirddə ümid hissini, özünə inamı yaradır, onları qalibiyyətə səsləyən işıqdır müəllim. O, şagirdi çörəyi ilə böyüdüyü ana Vətənə dönük çıxmamağa, millət üçün canını sipər etməyə, Vətən uğrunda savaşaraq ən uca zirvə olan şəhidlik zirvəsinə ucalmağa səsləyən bir anadır. Ey müəllim, sən əli qələm tutmayan kiçik bir körpədən Vətənə layiqli bir əsgər, həkim, yazıçı, hərbçi və başqa peşə sahibi yaradan bir dühasan...

Sənin parlaq nurunun işıltısında bu keşməkeşli həyatın hər hədə-qorxusundan, fələyin hər oyunundan əzmlə çıxmağı bacaran neçə-neçə balan var. Sən illər sonra belə, bəlkə də xəyalında heç vaxt xatırlanmadığını düşünəndə belə, düşüncələrin ən gözəl, ən incə yerində anılacaqsan. Ən çox irad tutduğun, ən dəcəl şagirdin belə səni nəmli gözlərlə xatırlayacaq...

Müəllim elə bir məfhumdur ki, onun haqqındakı gözəl sözlər yazmaqla bitməz. Gözəl şairəmiz Mirvarid Dilbazi müəllim haqda belə demişdir:

*Ah, ey uşaqlığın gözəl günləri,*
*əziz müəlliməm, hardasınız siz,*
*O məktəb illəri dönsəydi geri,*
*önündə hörmətlə indi çöküb diz,*
*Deyərdim bu şeirim, sənətim üçün,*
*həmişə, həmişə borcluyam sənə!!!*
*Şərəflə keçirdin ömrünü bütün,*
*nəsillər böyütdün doğma Vətənə,*
*Sözü inci kimi düzün dilimə,*
*öyrətdin düşünüb cümlə qurmağı.*

Bəli, həqiqətən də, hər hansı peşə sahibi olmağımızdan asılı olmayaraq, bunu öz müəllimlərimizə borcluyuq. Bəlkə də hər hansı bir peşədə işini sevmədən də öhdəsindən gəlmək olar, amma müəllimlik elə bir peşədir ki, məhz sevgi üzərində qurulmuşdur və əsla, sevgisiz olmaz. Mən bütün müəllimlərimin qarşısında baş əyir, atamın və müəllimlərimin yolunu davam etdirdiyim üçün qürur hissi keçirirəm. Müəllim gələcəyin memarıdır. Gəlin gələcəyimizin təməlini elə möhkəm qoyaq ki, gələcəkdə memarlığımıza baxıb qürur hissi keçirək. Bütün həmkarlarımın müəllim günü mübarək!

**Şəbnəm CƏBRAYIL**

**OVQAT**

## BU YOL GEDİR LAÇINA

Əziziyəm Qarabağ,
Qırxqıza bax, qara bax.
Vətən düşmən əlində,
Ürəyimdə yara, bax.
Vətən həsrətilə yaşayan Ana,
Dərdi ürəyində daşıyan Ana!



**Səhər Aslan qızı**
1936-cı ildə Şəlvə kəndində anadan olub.



Laçına,
Bu yol gedir Laçına.
Ana torpağıma,
Öz yurduma.

Laçına,
Allah nəsib eyləsin
Gedək bir də Laçına!

**Orxan Nazim oğlu Quliyev,**
*Sumqayıt Təbiət Elmləri Təmayüllü Gimnaziyanın 5 "f" sinif şagirdi*



**Orxan qardaşı Kənanla**

**ANIM**

## DOST, QARDAŞ ÖLÜMÜ GÖZ YARASIDI

Mərhum Məhəbbət Kazımovla tanışlığım 1980-ci illərə təsadüf edir. Onda o, sənətə təzə başlamışdı. Özü də səhv etmirəmsə, Bakıda Oleq Koşevoy küçəsində qalırdı. Sözümüz, ünsiyyətimiz tuturdu. O, məclisin müğənnisi, mən isə masabəyisi olardım. Mən bu sənətə çoxdan başlamışdım. Bu minval ilə Qarabağın çox rayon və kəndlərində bir yerdə məclis aparırdıq. Sadə, təvazökar, gözü-könlü tox, Vətənə, yurda bağlı, dostluq ilqarına düz bir cavan oğlan idi. O da ilk məclisdən mənim ülfətimə, şeiriyyatıma, nitqimə, davranışıma rəğbət bəsləyirdi. Mənim şeirlərimi də o vaxt məclislərdə, sonra isə mavi ekranda oxudu. “Bacı”, “İlk eşqin həsrəti, ilk eşqin dağı”, “Yaman darıxmışam səndən ötəri”, “Bu fələklə nərd atasan”, “Mən də vətənimə elə bağlıyam” və başqa şeirlərim ilk dəfə onun ifasında radio, televiziyada səslənib.



Sonra səmimi dostluğumuz davam etdi. Hər an bir-birimizdən soraq tutardıq. Mən kənddən, o şəhərdən zəng edərdik. Bəzən Bakıda, bəzən rayonlarda görüşərdik. Son görüşlərimizdən birini xatırladım. Bərdədə hansısa bir tədbir var idi. Çox sənətkarlar, çox adamlar gəlmişdi. Məhəbbət də Əlikramla ora gəlmişdi. Səmimi görüşdük, şəkil çəkdirdik, şirin söhbətlər etdik. Mənim bir neçə şeir kitablarımı götürdülər. Beləcə, xoş münasibətlə ayrıldıq. Sonra yenə tez-tez zəngləşirdik. Onun telefon nömrəsi 050 314 11 11 idi. 2013-cü ilin avqust ayında Bakıda Gömrük Hospitalında görüşdük. Mən orada müayinə olunurdum. O da mənimlə görüşməyə, hal-əhval tutmağa gəlmişdi. Yaxınlıqdakı çay evində əyləşib yaxşıca söhbətləşdik, dərdləşdik. Yurd həsrəti, Laçın faciəsi onu yandırırdı. Duyğulu insan üçün bu həsrəti çəkmək çətin idi. Elə o çətinliklərin nəticəsində də belə oldu.

Son dəfə televiziyada küskün, intizarlı, səhhətindən gileyli çıxışlar edəndən sonra mən ona “Oxu Məhəbbət, oxu”, “Səni gözləyir” və “Laçınım, Laçınım, Laçınım mənim” adlı şeirləri (son iki şeir bu jurnalda (“Laçın yurdu”, №1(12), 2014. səh.91-93) çap olunub) yazıb göndərdim.

Şəlvə çaydan qan axır,
Oxu, Məhəbbət, oxu...
Həkəri könül yaxır,
Oxu, Məhəbbət, oxu...

Hoçazda yad izi var,
Düzündə yad gözü var.
Sönüb gedən közü var,
Oxu, Məhəbbət, oxu...
Qopub qiyamət, oxu...

Yaman əyilib başım,
Selə dönüb göz yaşım.
Ağlayır torpaq, daşım,
Oxu, Məhəbbət, oxu...
Oxu qardaşım, oxu...
Dostum, sirdaşım, oxu...

Bu şeirlərdən sonra təkrar-təkrar zəngləşdik. İkimizin də bir arzusu var idi. Nə vaxtsa "Ovqat" verilişində birləşək. O müğənni kimi, mən isə şair kimi. Düzgün deyim imiş: Sən saydığını say, gör fələk nə sayır. Fələk acı günlər, əbədi ayrılıq, sonsuz həsrətlik qismətlərini saydı. Bu taleyə ağlar gözlə "Qaldı Məhəbbət", "Qalır" və "Sən" adlı şeirləri yazdım.

"Laçınım, Laçınım, Laçınım mənim",
Mahnın dodaqlarda qaldı, Məhəbbət.
Bu qara xəbərin çatdı Laçına,
Avazın dağlarda qaldı, Məhəbbət.

Tökdü göz yaşını hər bir guşələr,
Sıldırım qayalar, o sıx meşələr.
Dondu axarında gur şəlalələr,
Səsin bulaqlarda qaldı, Məhəbbət.

Zümzümən hər xəfif küləklərdədi,
Əməlin göylərdə mələklərdədi.
Müqəddəs amalın ürəklərdədi,
Əksin uzaqlarda qaldı, Məhəbbət.

Budaqdərə yaman ahda, amanda,
Hoçaz dağı qara geyib bu yanda.
Ömrün sonunda da fikrin Laçında,
O gözəl çağlarda qaldı, Məhəbbət.

Şiruyəyəm, "Eşqin tacı" şeirimi,
Xoşlayıb oxudun "Bacı" şeirimi.
Yazıram ömrünün acı şeirini,
Səni görrəm varaqlarda, Məhəbbət.

Allah Məhəbbətə behişt qismət eləsin! Dost, qardaş ölümü göz yarasıdı. Bu ağrıya dözmək çətindir. Məhəmməd peyğəmbərin bir deyimi var: "O adam ki səndən əbədi ayrılır, ona ağlamaq lazımdır". Bu gün mən Məhəbbət üçün həm ağlayıram, həm də onun sənət yollarına baxıb qürur duyuram.

**Sərraf ŞİRUYƏ,**
***Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvü, "Qızıl Qələm", "Məmməd Araz" və "H.B.Zərdabi" mükafatları laureatı***

ZİYALILARIMIZ



## NEFTÇİ ALİM

XX əsr Azərbaycan Respublikasında neft sənayesinin yüksək vüsətlə inkişaf etdiyi dövrdür. Bu dövrdə bütün sahələrdə olduğu kimi neft elmi və yataqların işlənməsi sahəsində də görkəmli, tanınmış alimlər və yüksək ixtisaslı istehsalatçı mütəxəssislər nəsli yetişmişdir. Belə mütəxəssislərdən biri də Azərbaycan Respublikasının Əməkdar mühəndisi, SSRİ Neftçıxarma Sənayesinin əlaçısı, SSRİ-nin Əmək Veteranı, Azərbaycan Respublikasının Əmək Veteranı və Respublika əhəmiyyətli təqaüdçü Çingiz İsgəndər oğlu Abbasovdur.

Çingiz İsgəndər oğlu Abbasov 27 noyabr 1926-cı ildə Laçın rayonunun Sus kəndində anadan olmuşdur. Atası dünyasını tez dəyişdiyindən, ailədə 3 uşaq anasının himayəsində yüksək zəhmətkeşlik ruhunda tərbiyə olunmuşdur.

Sus kəndində məktəb olmadığından o, 1936-1938-ci illərdə Qızılca kənd məktəbində təhsil almışdır. 1939-cu ildə ailəsi Laçın şəhərinə köçmüş və o, təhsilini orada davam etdirmişdir. Ç.Abbasov 1946-cı ildə Laçın şəhərindəki orta məktəbi əla qiymət, nümunəvi əxlaq və gümüş medalla bitirərək imtahansız M.Əzizbəyov adına Azərbaycan Sənaye İnstitutunun (indiki ADNA) neft-mədən fakültəsinə qəbul olunmuş, 1951-ci ildə ali təhsilini neft və qaz yataqlarının işlənməsi ixtisası üzrə tamamlayaraq dağ mühəndisi adını almışdır. Onun peşə seçimində atasının XIX əsrin sonlarından 1920-ci ilə qədər Bakı neft mədənlərində fəhlə işləməsi müəyyən rol oynamışdır.

Ç.Abbasov əmək fəaliyyətinə yeniyetmə yaşından başlamışdır. 1942-ci ildə ailə başçısı olan böyük qardaşı Cavanşir könüllü olaraq Sovet Ordusu sıralarına gedir və Böyük Vətən müharibəsində həlak olur. Odur ki, 4 nəfərdən (özü, qoca anası, qardaşının arvadı və 2 aylıq oğlu) ibarət ailənin bütün ağırlığı onun üzərinə düşür. O, 1942-1946-cı illərdə təhsil aldığı Laçın şəhər orta məktəbində baş pioner dəstə rəhbəri (eyni zamanda kitabxanaçı), axşamlar mədəniyyət evində kinomexanik köməkçisi işləmişdir.

İnstitutu qurtardıqda Ç.Abbasov təyinatla Dövlət Elmi-Tədqiqat Layihə İnstitutuna (indiki AzNQSDETLİ) göndərilir və qısa müddətdə mühəndis vəzifəsində çalışır.

Ailə vəziyyəti ilə əlaqədar olaraq öz xahişi ilə 1952-ci ilin martında "Leninneft" trestinə (indiki “Balaxanıneft” NQÇİ) köçürülmüşdür. 1952-

1958-ci illərdə o, 8-ci mədəndə neftçıxarma ustası (sahə rəisi), 12-ci mədəndə baş mühəndis və 14-cü mədəndə müdir vəzifəsində işləmişdir.

Ç.Abbasov səhhətinin pisləşməsi ilə əlaqədar olaraq 1958-ci ilin sonunda indiki AzNQSDETLİ-yə köçürülmüş, 1966-cı ilin mayına qədər Neftçıxarma texnologiyası laboratoriyasında böyük mühəndis, böyük elmi işçi və laboratoriya müdirinin müavini vəzifələrində çalışmışdır. İnstitutda işlədiyi dövrdə aparılmış 12 elmi-tədqiqat işinin rəhbəri olmuş, 17 dərc olunmuş kitab və məqalə, o cümlədən akademik Azad Mirzəcanzadənin elmi redaktorluğu ilə yazılmış, Azərbaycan SSR Ali və Xüsusi Orta İxtisas Təhsili Nazirliyi tərəfindən təsdiq edilmiş neft texnikumları tələbələri üçün "Neft yataqlarının istismarı" dərsliyini (40 ildən yuxarıdır ki, istifadə olunur), 15 məqalə, "Laydan qum çıxarılması və quyularda tıxac əmələgəlməsi ilə mübarizə" monoqrafiyasını yazmışdır.

O, AzNQSDETLİ-də böyük fasilələrlə 10 ilə yaxın işləmiş və 50 əsərin müəllifi və yaxud həmmüəllifi olmuşdur.

Demək olar ki, bütün məqalə, hesabatlar və kitabları tətbiqi xarakter daşıyır, alınmış nəticələrin yataqların işlənməsində və tədris prosesində müəyyən əhəmiyyəti vardır.

Nazirlikdə işlədiyi dövrdə Ç.Abbasov vəzifə səlahiyyətləri daxilində neftçıxarma müəssisə və təşkilatları arasında kəsilmiş əlaqələrin bərpa edilməsi, onların problemlərinin həll edilməsi, istehsalat birliklərinin fəaliyyətinin təhlil edilməsi əsasında işlərdəki nöqsanların aradan qaldırılması və dövlət planlarının yerinə yetirilməsi üçün tədbirlərin hazırlanması və həyata keçirilməsi, yataqların işlənməsinə nəzarət, maddi-texniki bazalarının möhkəmləndirilməsi işlərində fəal iştirak etmişdir.

Çingiz Abbasov sağlamlığı ilə əlaqədar (iqlim şəraiti düşmədiyindən) 1973-cü ilin əvvəllərində Nazirliyin təqdimatı ilə Azərbaycan SSR-in Ali və Xüsusi Orta İxtisas Təhsili Nazirliyi sistemində SSRİ-də ən böyük texnikum olan Bakı Neft Texnikumuna direktor təyin edilir və eyni zamanda "Neft yataqlarının istismarı" ixtisas fənnindən dərs deyir. Texnikum SSRİ-dən başqa 30-a yaxın xarici ölkə (Yaxın Şərq, Asiya, Afrika, Latın Amerikası və s.) üçün 13 ixtisas – neft-qaz çıxarılması, neft-kimya, maşınqayırma və s. sahələr üzrə kadrlar hazırlayırdı. Tələbə kontingenti 3500-ə yaxın idi. Onların 200 nəfərini xarici ölkələrdən gələn əcnəbi vətəndaşlar təşkil edirdi, lakin texnikumun maddi-texniki bazası və tələbələrin məişət-yaşayış şəraiti aşağı səviyyədə idi.

Onun rəhbərliyi dövründə texnikumun maddi-texniki bazası xeyli möhkəmləndirildi. Nəticədə texnikum respublikada keçirilən bir çox yarışların qalibi oldu.

Ç.Abbasov Bakı Neft Texnikumunun direktoru olmaqla yanaşı, respublikadakı 80 texnikum üzrə Direktorlar Şurasının sədri təyin edilmişdir.

Uzun müddət SSRİ Neftçıxarma Sənayesi Nazirliyində, Bakı Neft Texnikumunda və "Azneft" İB-də rəhbər vəzifələrdə işlədikdən sonra İB-də aparılan struktur dəyişiklikləri ilə əlaqədar olaraq 2003-cü ilin aprelində AzNQSDETLİ-yə köçürülmüşdür və o vaxtdan laylara fiziki-kimyəvi üsullarla təsir laboratoriyasında böyük elmi işçi vəzifəsində işləyir. Ötən qısa müddətdə o, laboratoriyada aparılan elmi-tədqiqat işlərində fəal iştirak edir və şərik müəlliflərlə birlikdə 8 məqaləsi dərc olunur.

Ümumiyyətlə, Ç.Abbasov təklikdə və yaxud şərik müəlliflərlə birlikdə dərc olunmuş 31 əsərin və 14 elmi hesabatın müəllifidir.

Tanınmış neftçi alim uzunmüddətli – 65 ildən artıq qüsursuz iş fəaliyyətinin 60 ilini neft sənayesinin istehsalat, elm, təhsil və dövlət idarəçiliyi sahələrində çalışmış və cəmiyyətin ictimai həyatında fəal iştirak etmişdir. Hazırda o, yaşının qoca çağında da səmərəli fəaliyyətini davam etdirir.

Çingiz Abbasov həm də nümunəvi ailə başçısıdır. Vətən üçün, xalq üçün layiqli övladlar tərbiyə edib. Oğlu İlqar Abbasov Neft-Qaz Elmi-Tədqiqat Layihə İnstitutunun böyük elmi işçisi, qızı Səhər xanım isə həmin institutun kiçik elmi işçisidir. Kiçik qızı Təranə xanım isə Türkiyədə yaşayır, İstanbul İncəsənət Universitetinin müəllimidir.

## PUBLİSİSTİKA

### QAÇQINAM DEYƏ

İlk dəfə Bakıya 6 yaşımda gəlmişəm. Bacımın mənə paytaxtın əsrarəngiz gözəlliyini göstərmək istəyi ilə əlimdən tutub gətirdiyi bu şəhərin küçələrini yarıkönül gəzdiyim az-çox yadımdadı.

Neçə gün qaldığımı xatırlamıram, amma ilk dəfə evimizdən, anamdan-atamdan uzaq düşdüyüm üçün xiffət etdim. Bacıma "tez elə, məni evimizə qaytar" deyib ağlamağımı unutmamışam.

Nə isə... Uşaq təxəyyülümün sirli-sehrli Bakısının izdihamından çəkinib, dağlar qoynundakı sakit şəhərimi istəmişdim. O şəhərimi ki, illər sonra yenə ailəmlə birlikdə, erməniyə əsir düşməmək üçün min bir əziyyətlə tərk etmişdim.

Yenə yolumuz Bakıyaydı və yenə xiffət edəcəkdim, amma geriyə dönəcək şəhərim yox idi. Əvəzində sığına biləcəyimiz, güvəndə ola biləcəyimiz izdihamlı paytaxtımız var idi. Çox təəssüf ki, müharibənin sərt qanunları bizdən asılı olmayaraq ən ləyaqətli insanları məğlub, evini isə darmadağın edir, düşmənə əsir düşürür və ya yurdundan didərgin salır.

Biz də müharibə adamlarıydıq və nə yazıq ki, bu taleyi biz də yaşamağa məhkum olmuşuq.

Ağlım kəsəndən valideynlərimin, qohumlarımın dilindən həmişə insanları sevməyi, onlara şəhərə, rayona, kəndə görə yox, özünə görə hörmət etməyi öyrənmişəm.

Gələn qonağa ən gözəl şəkildə qulluq göstərməyi, ən yaxşı yeməkləri bişirib, təmtəraqla yola salmağı böyüklərimdən görmüşəm. Belə də olmalı idi. Bu, hər şeydən əvvəl insanlıq borcumuz idi.

Paytaxta gəldiyimiz ilk günlərdə insanların bizə qarşı aqressivliyini, az qala yoluxucu xəstəliyimiz varmış kimi davranışlarını uşaq ağlımla dərk edə bilmirdim. Mənə atam-anam, müəllimlərim Azərbaycanın hər tərəfini, paytaxtını sevməyi aşılamışdı.

Və bizim üçün hər yer Vətənin bir parçası idi. Ona görə də böyüklərimdən fərqli olaraq, çox zaman qınaq dolu nəzərlərlə baxanları başa düşməkdə acizlik çəkirdim.

Bəziləri halımızdan anlasalar da, amma əksəriyyət insanın nəzərində torpaqlarını erməniyə qoyub gələn insanlardan başqa birisi deyildik.

Bir çoxlarının gözündə dağdan enən, ayağı qaloşlu palçıq içindən çıxıb, şəhərin tərtəmiz küçələrini kirlədən, qalmağa yerləri olub da, keflərindən kibrit qutusu boyda otaqları olan yataqxanalara, pansionatlara, ən nəhayət özgə evlərinə yığılan məcburi köçkünlər idik.

Bəzən içimdən gücüm gəldikcə qışqırıb, o insanlara demək istədiyim o qədər çox sözüm var idi ki. İllərlə ürəyimdə daşlaşan və yük olan sözləri son vaxtlar yenə eşitdiyim tənələrə görə yazmaq istədim.

İstədim ki, biləsiniz ki, bizə dağdan enənlər deyirlər, amma o dağları yarıb, qoynunda gözəl evlər tikib yaşayan da biz idik.

Ac-yalavaclar deyirlər, amma, bu gün şəhərin mağaza vitrinlərində bəhbəhlə axtarılan kəndin, rayonun ən təmiz nemətləri bizim süfrəmizdən heç vaxt əskik olmayıb.

Ayağı qaloşlu, əli qabarlı kənd qadınlarının, kişilərin böyütdüyü oğlanlar, qızlar paytaxtın ən yaxşı universitetlərində təhsil alıb, bu gün böyük auditoriyalarda yüzlərlə tələbəyə bilik öyrədir, maarifləndirir.

Biz həmişə milli-mənəvi dəyərlərimizə hörmətlə yanaşıb, Azərbaycan mədəniyyətini folklorundan tutmuş, müasir dövrədək ən yaxşı şəkildə yaşatmışıq.

Zaman bəzən hər şeyə dərman olmasa da, çox şeyə dərman olur. Mən və yaşıdlarım illərlə bu tənənin ağırlığını çəkə-çəkə, özümüzü şəhər abhavasına öyrəşdirərək böyüdük. Bu torpaqda atasını, dayısını, əzizlərini dəfn edənlər çox oldu. Sığındığımız paytaxt və digər rayonlarda qəbiristanlıqlarımız yarandı. Dərdimizi anlayanlar halımıza acıdılar, nisgilimizə şərik oldular. Bizi qəbul etməyənlər də pis-yaxşı öyrəşdilər məcburi köçkünlərə...

Bəzilərinin dilində "qaçqınam deyə, tank sürməliyəm, və ya "ay Allah, sən bu qaçqınların corablarını laykadan elə" kimi şit, bayağı ifadələr yaratdılar, lətifəyə çevirdilər....

Özlərinə gün-güzəran düzəldib, evi-eşiyi olmayanları da qınaq obyektinə çevirən məcburi köçkünlər də oldu, elsizliyə, evsizliyə heç bir il dözməyib, bu dünyadan köçənlər də...

Bəlkə yenə bu mövzudan yazmağım xoşunuza gəlməyəcək. Amma mən bu Vətəni qaçqınına, köçkününə, yerlisinə bölənləri qınayıram. Çünki böləndükcə cılızlaşırıq, cılızlaşdıqca nə Vətən sevgimiz qalır, nə də insanlıq.

Qaçqın da, məcburi köçkün də öz istəklərinin yox, müharibənin qurbanlarıdır. Ona görə də ürəyində yurd-yuva yarası gəzdirən yaşlı insanlara, ağbirçəklərə, ağsaqqallara söz yarası vurmadan, sevgi göstərmək də bir təsəllidir.

Dövlətimizin qaçqın və məcburi köçkünlərə göstərdiyi diqqət və qayğı bütöv bir Azərbaycan sevgisinin təzahürüdür. Bizi də sındırmayan, gələcəyə inamlı edən də budur. İnanıram ki, bir gün bütün işğal olunmuş ərazilərimiz azad olacaq və biz də o torpaqlara qayıdacağıq. Tikanlı sözlər deyib, könül bulandıranlara isə tək bir sözüm var...



Bizə qucaq açan və açmayan hər kəsi əzəmətli dağlarımızın, yaşıl meşələrimizin və evimizin qonağı edəcəyik. Çünki Azərbaycan hamımızın Vətənidir və bu torpaq üzərində gəzmək, havasında nəfəs almaq onu layiqincə sevən hər kəsin haqqıdır.

**Qönçəgül KAMALQIZI**

**ANIM**

## ÖLÜMÜ ƏSİRLİKDƏN ÜSTÜN TUTAN 23 YAŞLI QADIN...

Səmanın ölümündən sonra, avqust ayının 5-də əsirlikdə qalan qızı 1 yaşlı Nurlanə Hümbətova geri alınır. Lakin körpə Nurlanənin faciəsi bununla bitmir.

Dekabrın 7-də Suraxanı rayonunun "Yeni Günəşli" qəsəbəsində yerləşən laçınlıların "Mərasim Evi"ndə feysbuk sosial şəbəkəsinin "Laçın və laçınlılar" qrupu şəhid Səma Kərimovanın xatirəsinə həsr olunmuş anım tədbiri keçirib.



Qrupun vaxtaşırı vətənpərvərlik mövzusunda keçirdiyi bu cür tədbirlər artıq ənənə halını alıb. Şəhidlərimizin, döyüşçülərimizin keçdiyi şərəfli yolun təbliğinə xidmət edən və Səma Kərimovanın xatirəsinə həsr olunan bu tədbirdə şəhidin ailə üzvləri, Qarabağ müharibəsi iştirakçıları və tanınmış ziyalılar iştirak ediblər. "Laçın yurdu" jurnalının baş redaktoru Arif Məmmədlinin çıxışı və Azərbaycanın ərazi bütövlüyü uğrunda canından keçən şəhidlərin ruhunun bir dəqiqəlik sükutla yad edilməsindən sonra Xatirə Laçın Səma Kərimova haqqında tədbir iştirakçılarına geniş məlumat verib.

Səma Kərimova 31 dekabr 1969-cu ildə Laçın rayonunun Nağdalı kəndində dünyaya gəlib. 1974-cu ildə orta məktəbə gedib və 1984-cu ildə yaxşı qiymətlərlə təhsilini başa vurub.

1986-cı ildə Səma Kərimova Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) filologiya fakültəsinə qə-

bul olub. İnstitutu bitirdikdən sonra Nağdalı kənd orta məktəbində pedaqoji fəaliyyətə başlayıb. 17-18 may 1992-ci ildə Laçın rayonu işğal olunan zaman Səma və ailəsi də öz doğma yurd-yuvasını tərk etmək məcburiyyətində qalıb. Ailə Laçından çıxdıqdan sonra Bərdə rayonunun Qaradəmirçi kəndində yaşayan qohumlarıgilə pənah gətirib.

1992-ci ildə Azərbaycan Ordusunun Kəlbəcər və Qubadlı istiqamətindən Laçın rayonunun azad edilməsi üçün apardığı genişmiqyaslı hərbi əməliyyatları zamanı Laçın şəhəri istisna olmaqla rayon erməni işğalçılarından təmizlənir. Əhalinin əksəriyyəti işğaldan azad edilmiş ərazilərə geri dönməyə başlayanda Səma da həyat yoldaşı ilə birlikdə avqust ayının 25-də Laçına qayıdıb.

Ancaq Laçında qalmaq çox da uzun sürməyib. 1993-cü ilin mart ayında ermənilərin geniş hücum əməliyyatları zamanı əhali rayon ərazisini tərk etməyə məcbur olub. Mart ayının 31-də Səma ailəsi və qohumları ilə birlikdə yenidən Laçını tərk etmək məcburiyyətində qalıb.

31 mart 1993-cü ildə Laçın eli üçün çox ağır bir faciə baş verir, Səma və ailəsinin də olduğu maşın karvanı Kəlbəcər rayonu ərazisində yerləşən tuneldə mühasirəyə düşür.

Mühasirə zamanı Səmanın dayısı Asif və bibisi elə oradaca şəhid oldu, böyük dayısı Yusif Əliyev ilə Səma isə ağır yaralandılar. Səma Kərimova, bir yaşlı qızı Nurlanə Hümbətova və digər əsir düşmüş yaralıları əvvəlcə Vəng kəndinə, sonra isə Xankəndində yerləşən uşaq xəstəxanasına gətirirlər.

1993-cü il may ayında anasına yazdığı məktubunda bildirirdi ki, qızı Nurlanə ilə birlikdə Xankəndində uşaq xəstəxanasındadır, 1 aydan çoxdur ki, sol ayağından ağır yaralıdır, ayağa qalxa bilmir.

Səmanı və qızı Nurlanəni geri almaq üçün ailəsi ermənilərlə danışıqlar aparır. Tələb olunan məbləğ çətinliklə olsa da toplanır.

Ancaq ölümü əsirlikdən üstün tutan Səma özünə qəsd etmək qərarına gəlir. Və may ayının 15-də Səma Kərimova intihar edərək şəhidlik zirvəsinə yüksəlir. Ermənilərlə uzun sürən danışıqlardan sonra iyun ayının 23-də Səmanın cəsədi alınaraq Bərdə rayonunda dəfn edilir.

Səmanın ölümündən sonra, avqust ayının 5-də əsirlikdə qalan qızı 1 yaşlı Nurlanə Hümbətova geri alınır. Lakin körpə Nurlanənin faciəsi bununla bitmir. Ermənilər öz murdar əməllərindən əl çəkməyərək avtomatın qundağı ilə Nurlanənin boynunun arxasına vurub onu əbədi həyat işığından məhrum edirlər. Adı Nurlanə olan körpə ömürlük nura həsrət qalır...

Tədbirdə səslənən bu faciəli tarixçəni dinləyən iştirakçılar çıxış etməyə çətinlik çəkdiklərini bildirsələr də, danışmağı özlərinə bir borc hesab etdilər.

Çıxış edən Laçın polis batalyonunun komandiri olmuş polkovnik-leytenant Çingiz Abbasov, keçmiş Güləbird batalyonunun qərargah rəisi Rövşən Atakişiyev, Qarabağ müharibəsi iştirakçısı, hüquqşünas Ərşad Hüseynov, keçmiş rota komandiri Cabbar Alıyev, habelə digər döyüşçülər Babək Məmmədov, Xəyyam Nəsirov, Habil Muradov və Sahib Xasməmmədov çıxış edərək həm keçdikləri döyüş yolundan danışdılar, həm də Səmanın bir Azərbaycan qadını olaraq seçdiyi şərəfli ölüm yolunu, ucaldığı şəhidlik zirvəsini bir örnək olaraq gördüklərini qeyd etdilər.

Daha sonra çıxış edən Solmaz Cahangirova və Respublika Əlil Qadınlar Cəmiyyətinin sədri Məhluqə Rəhimova Səma Kərimovanın adının əbədiləşdirilməsinə ehtiyac olduğunu söylədilər və Səmanın adına küçə verilməsini, abidəsinin ucaldılmasının vacibliyini qeyd etdilər. Tanınmış jurnalist Sultan Laçın, yazıçı-publisist Ötərxan Eltac, Hacı Vahid torpaq, millət, namus, şərəf uğrunda canını fəda edən bu türk qızının bir qeyrət rəmzi olduğunu və bu qəhrəmanlığın bütün nəsillərə nümunə olduğunu söylədilər.

Tədbirdə Səmanın müəllimi və iş yoldaşı olaraq iştirak edən Əyyub müəllimin, Səmanın şagirdi olmuş Orxan Cəbrayılovun çıxışları isə həm tədbir iştirakçılarını, həm də Səmanın qızı Nurlanəni xüsusilə təsirləndirdi. Tədbirin sonunda çıxış edən Səmanın anası Sevda Kərimova, bacısı Səbinə Kərimova bu tədbirdə səslənən bəzi xatirələri Nurlanənin ilk dəfə eşitdiyini vurğuladılar.

Şəhidin anası bu cür tədbirin keçirilməsinə görə feysbuk sosial şəbəkəsində fəaliyyət göstərən “Laçın və laçınlılar” qrupuna, onları daim diqqət mərkəzində saxlayan Laçın Rayon İcra Hakimiyyətinə və Qarabağ Müharibəsi Əlilləri, Veteranları və Şəhid Ailələri İctimai Birliyinə minnətdarlığını bildirdi.

Tədbir boyu göz yaşlarına sahib ola bilməyən, hələ bir yaşındaykən erməni əsirliyinin məşəqqətini yaşayan və erməni cəlladları tərəfindən dünya işığına həsrət qalan Nurlanə çox danışa bilməyəcəyini söylədi və bu tədbirə görə təşkilatçılara və tədbir iştirakçılarına minnətdarlığını bildirdi.

Tədbirin sonunda erməni vəhşiliyi ucbatından anası ilə bərabər gözlərinin nurunu da itirmiş Nurlanənin beynəlxalq ictimaiyyətə, xarici ölkə səfirliklərinə ünvanlanmış qəlbləri göynədən müraciəti oxundu.

**Ramil CƏBRAYIL**

**POEZİYA**

**Azər XANLAROV**



1983-cü ildə Laçın rayonunun Qılışlı kəndində anadan olub. Polad Məmmədov adına Qarıqışlaq kənd tam orta məktəbini bitirib. Bakı Asiya Universitetinin filologiya fakültəsini bitirib. 2005-ci ildən pedaqoji fəaliyyətlə məşğuldur.

Kiçik yaşlarından bədii yaradıcılığa başlayıb. Şeirləri "Laçın", "Azad qələm", "Gənclər üçün" qəzetlərində, "Ulduz" jurnalında və "Ziya" antologiyasında çap olunub. "Yaşanmış günlər" (2004), "Bu dərdi kim daşıyar" (2009) və "Ömür bumu" (2014) kitablarının müəllifidir.

## MƏHƏBBƏT

Hər sözündə Laçınını ağladı,
Əridi şam kimi, yandı Məhəbbət.
Səsi qulaqlarda, dərdi gözlərdə,
Ürəklərdə axan qandı Məhəbbət.

Vətənsiz yaşadı mahnılarında,
Ağlatdı, sızlatdı mahnıların da.
Kim demiş Məhəbbət duyğularımda,
Sinəmdə göynəkdi, candı Məhəbbət.

Azərəm, səsində yaşar kimiyəm,
Laçın mahnısının canlı qəmiyəm.
Nədən ağlamayam, nədən deməyəm,
Göylərdə zirvədi, dandı Məhəbbət.

## QADA VERİB GETMİSƏN...

Əllərimdə əllərinin istisi,
Ürəyimi oda verib getmisən.
Keçmişimiz xatirələr yağışı,
Nə olsun ki, bada verib getmisən.

Gözlərim də həsrətindən yaş olub.
Baharım da, inan, sənsiz qış olub.
Nə etmişəm, qəlbin dönüb daş olub,
Aşiqinə qada verib getmisən.

## YATIM GECƏNİ

Bezib bu həsrətli odun əlindən,
Gəlim ürəyində yatım gecəni.
Nazını bir kimsə görməsin deyə,
Üzünə, gözünə qatım gecəni.

Yatım ayılmayım talan ömrümü,
Keçmişə tökülüb qalan ömrümü.
Röyalar qoynunda dolan ömrümü,
Sən Allah kamıma çatım gecəni.

Nə olar, saçımda əllərin olsun,
Sevgi işığımda illərin olsun.
Gül-çiçək düzdüyüm tellərin olsun.
Unudum hicranı, atım gecəni.

## SƏNSİZ YAŞAYA BİLMİRƏM

Dərdin çöküb ürəyimə,
Sətir-sətir, ilmə-ilmə.
Yazılmısan taleyimə,
Pozulmur ki, pozulmur.

Yaşatdığın hicranı,
Yaratdığın dastanı
Yazıram gecə-gündüz,
Azalmır ki, azalmır.

İllər ötür tufanda,
Ömür qışda, boranda.
Gəlib keçsə zaman da,
Yaz olmur ki, yaz olmur.

## SƏN DƏ BARIŞ

Çörəyə, suya toxam,
Öz ömrümdən yeyirəm.
Ayrılıq adamıyam,
Qara həsrət geyirəm.

Yuyub göz yaşlarımda,
Buludu yerə sərdim.
Gözucu baxışına,
İtib gedərdi dərdim.

Taleyimiz bu imiş,
Sən ki yer adamısan.
Göyə baxıb üzülmə,
Get evinə, yadınsan.

## BU DÜNYANIN

Mən bir ömür yaşamadım
Gözlərində bu dünyanın.
Həsrət oldum, kədər oldum
Sözlərində bu dünyanın.

Gecələr həmdəmim oldu,
Sevincim də qəmim oldu.
Mənlə yanan kimim oldu
Közlərində bu dünyanın?

Saç ağarır, əllər əsir,
Baş açmıram, Allah, nə sirr.
Məcnun kimi qaldım yesir
Düzlərində bu dünyanın.

## GÖZÜM GÖZÜNDƏ QALIB...

Mən sənə vurulmuşam,
Gözüm gözündə qalıb.
Özümü unutmuşam,
Fikrim özündə qalıb.

Sevincinə gülmüşəm,
Səni canım bilmişəm.
Səni elə sevmişəm,
Sevgim üzündə qalıb.

Azər qəlbi qan olub,
Könlü də talan olub.
Məcnun da yalan olub,
Eşqin düzündə qalıb.

## LAÇIN HƏSRƏTİ

Laçın adı ürəyimdə,
Qanım yazıb sətir-sətir.
Ölüncə əzab çəkəcəm,
Faydası yox, min ləl gətir.

Küsdü, yuxuma gəlmədi,
Onsuz heç üzüm gülmədi.
Yad əllərdə inildədi,
Sal qayalar, gen dərələr,
El dilində neçə ildir
Qan ağlayır xatirələr.

**ANIM**

## "LAÇINIM" DEYƏ-DEYƏ ƏBƏDİYYƏTƏ QOVUŞDU



İlin başlanğıc ayı olan yanvar kədər dolu gəlişiylə qəlbimizi üşütdü. Sevinci həmişə çarmıxa çəkməyə çalışan ölüm bizi indi də ölməz sənətkarımız MƏHƏBBƏT KAZIMOV itkisinin sınağına çəkdi. Xalq musiqi aləminin Məhəbbətini itirdi. Özü də 61 yaşında. Çox heyif! Xalqın sevimli xanəndəsi, Azərbaycanın qüdrətli sənətkarı Məhəbbət Kazımov "Laçınım" deyə-deyə əbədiyyətə qovuşdu! Bu itkiyə Kirs, Yeddiqat, Çalbayır, İşıqlı, Boz dağ, Keçəl dağ, Qaragöl, Ər təpə, Hoçaz qayası, Soyuq bulaq, Çorman ağladı, Laçın ağladı, Qarabağ ağladı, bütövlükdə Azərbaycan ağladı. Məhəbbət Kazımov uzun illərdi ki, musiqimizin, muğamımızın keşiyində ləyaqətlə durdu, onu sədaqətlə qorumağa çalışdı. Doğma yurdu Laçın yanğısı onun ruhunu, qəlbini çarmıxa çəkdi. Bu yanğını avazında, musiqisində yaşatdı. Amma vətən həsrəti, vətən yanğısı onu rahat buraxmadı. Qarabağ ağrısını, Çorman həsrətini, Laçın nisgilini özüylə apardı. Apardı ki, tək-tənha qalmasın soyuq məzarda, dərdləriylə dərdləşsin. Məhəbbət Kazımov bir sənətkar kimi qeyrət ucalığını, saflığı və bütövlüyü qəlbində, ruhunda daşıyan mürid idi. Onun bütövlükdə aldığı nəfəs – yurd-yuvası, el-obası idi. Laçınlılar Laçının ətrini onun səsindən, "Laçınım" mahnısından, bir də özüylə söhbətindən, şirin, həm də ağrılı kəlmələrindən alırdılar. Məhəbbət Kazımov sənətinin saysız-hesabsız vurğunlarından biri də mənəm. Həssas, kövrək ürəklərin nəğməsidir Məhəbbət Kazımovun səsi! O səs dağlar qədər uca, dəryalar qədər dərin, səmalar qədər sonsuzuydu. Şaqraq zəngulələri, ecazkar zil səsi, hamını dəli-divanə etdiyi kimi, mənim də qəlbimə, ruhuma hakim kəsilmişdi. Biz bu səsi itirdik, bu səsin sahibini itirdik, bəlkə də deyərdim ki, Laçını yenidən itirdik. Kədər boyalı, qəzəb boyalı, sevinc boyalı mahnıları ürəyimizdə qanad açdı, pərvazlandı. Məhəbbətin yoxluğuna onun sənət dostları, onu sevənlər, ona vurğun olanlar, şairlər, yazıçılar ağladı. Bu dərd böyük şairimiz Ramiz Qusarçaylını, musiqişünas, böyük sənətkarımız Murad Rzayevi sarsıtdı, xanəndə Məzahir Əliyevi ağlatdı. Bu sızıltıların içində mən də var idim.

Özümə məxsus olmayan tərzdə hönkürdüm. Doğrudanmı Məhəbbəti itirdik?! – deyə, ahım göyə qalxdı...

Allah sənə rəhmət eləsin, böyük sənətkar! Məzarın nurla dolsun! Sən xalqın ən sevimli oğlu, ən sevimli sənətkarı kimi daim qəlbimizdə yaşayacaqsan!

**Elnur BAXIŞ,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

## CƏNNƏTİNİ BU DÜNYADA QAZANAN KİŞİ

Jurnalımızın 2012-ci ildə işıq üzü görən 4-cü sayında uzun illər Laçın rayonunda məsul vəzifələrdə çalışan, son dövrlərdə ağır xəstəlikdən əziyyət çəkən dövlət əhəmiyyətli təqaüdçü Səlim Səlimovla həmsöhbət olmuş, haqqında bir yazı hazırlamışdıq. Həmin yazıda amansız xəstəliklə mübarizə aparan Səlim müəllimə bu mübarizədə yardımçı olan Gülarə xanım Şəmistan qızının fədakarlığını xüsusi qabartmış, 20 ilə yaxın müddətdə qayğıya daha çox ehtiyac duyan ərinə alnını turşutmadan sədaqətlə xidmət göstərən bu türk qadınının gənc qızlarımıza ən yaxşı örnək olduğunu yazmışdıq. Elə o vaxt çoxuşaqlı ailədə tərbiyə alan Gülarə xanımın valideynlərini daha yaxından tanımaq arzusu keçmişdi ürəyimizdən. Müəyyən səbəblərdən reallaşması xeyli gecikən bu arzumuz jurnalımızın feysbuk səhifəsinə gələn bir mesajla yeniləndi. Bu mesajdan sonra özümüzü qınayası olduq və min illərin sınağından çıxmış “bu günün işini sabaha qoyma” atalar sözünün nə qədər doğru olduğunu sanki təzədən anladıq. Sonrakı peşmançılıq fayda verməsə də...

Təməlində halallıq, zəhmətsevərlik, şükranlıq olan bu böyük ailə ilə tanışlıq üçün “Yeni Günəşli” yaşayış massivinə yollananda valideynlərdən biri vardı, biri yox. Artıq haqq dünyasına qovuşan Şəmistan Kərimov əslində cənnətini bu dünyada qazanmışdı. Cənnətini bu dünyada qazananların tərifini isə Həzrət Məhəmməd (s) verib. Bəşəriyyətin sonuncu peyğəmbəri deyirdi ki, heç vaxt övladlarınıza oğlan və qız olduğuna görə fərq qoymayın. Əgər fərq qoysanız üstünlüyü qız övladına verin. Unutmayın ki, üç qız övladına dürüst tərbiyə verib onları ailə-uşaq sahibi edən ata-analar cənnətlərini bu dünyada qazananlardır. Həyatın hər üzünü görən, İkinci Dünya müharibəsinin od-alovundan keçən və ömrünün ahıl çağında Qarabağ mühari-

bəsinin ağrı-acısını da yaşayan veteranımızla sağlığında görüşə bilməməyimizdən təəssüflənsək də, təsəllimiz bu idi.

Bəli, 65 il bir yerdə ömür sürən Şəmistan Əlfəsiyaf oğlu və Kəmalə Seyfəli qızı 10 qız övladını böyüdüb boya-başa çatdırıblar, ailə-uşaq sahibi ediblər, onların hər birinin təhsil almasına nail olublar. Məhəmməd peyğəmbərin təbirincə desək, cənnətlərini üç dəfə bu dünyada qazanıblar.

Qonağı olduğumuz ailədə ailənin başçısı haqqında keçmiş zamanda danışmaq çətin idi. Hələ xatirələr köhnəlməmişdi. Hər söhbətin içindən adı keçirdi, işıqlı siması boylanırdı Şəmistan Kərimovun. Adama elə gəlirdi ki, o, yaxası orden və medallarla dolu pencəyini qürurla divardan asaraq harasa çıxıb, indicə qayıdacaq. Doğrusu, nədən başlayacağımızı əvvəldən planlamadığımızdan çaşıb qalmışdıq. Çay süfrəsi arxasında söhbətimizin axarı tez-tez dəyişirdi. Gah ötən illərə qayıdır, gah bu gündə dayanır, gah da arzuların qanadında gələcəyə uçurduq. Nədənsə bir anın içində elimizin adət-ənənəsi yadımıza düşür. Adətimizə görə, ilk sözü həmişə ailənin başçısı deməlidir. Biz də elimizin adətini pozmaq istəmirik və qəhrəmanımızın təqdimatına öz əli ilə yazdığı tərcümeyi-halla başlayırıq: “Mən, Kərimov Şəmistan Əlfəsiyaf oğlu, 1923-cü ildə Ağcayazı kəndində yoxsul bir ailədə anadan olmuşam. Atam və anam inqilabdan əvvəl əkinçi kəndli olublar. İnqilabdan sonra isə 1935-ci ildə kolxoza yazılıblar. Atam kolxoz sədri, ferma müdiri, ambardar və briqadir işləyib.



Yeddi yaşında məktəbə getmiş və 1939-cu ildə Piçənis kənd məktəbinin 7-ci sinfini əla qiymətlərlə bitirmişəm. Məni Ağcayazı məktəbinə müəllim təyin ediblər, sonra ordu sıralarına çağırıblar. 1946-cı ildən Vağazin kənd 7 illik məktəbində, 1948-ci ildən isə Kürdhacı kənd orta məktəbində müəllim işləmişəm. 1949-cu ildə Piçənis kənd 7 illik məktəbində katib, 1953-cü ildə Hacısamlıda kitabxana müdiri vəsifəsində çalışmışam”. Tərcümeyi-halında 1961-ci ildən Laçın yerli sənaye kombinatının taxta emalı sexində hesabdar işləməsi, işsiz qalması barədə də qeydlər var. Göründüyü kimi, ilk baxışdan o qədər də diqqət çəkməyən sadə bir həyat yolu.

Tərcümeyi-halının daha keşməkeşli səhifəsini isə “Laçın” qəzetinin 8 may 1986-cı və 14 oktyabr 1986-cı il tarixli saylarında oxuyuruq: “1942-ci ildə gənc Şəmistan hərbi komissara ərizə yazıb könüllü olaraq cəbhəyə getmək istədiyini bildirir. Əvvəlcə Tiflisdə 6 ay hərbi hazırlıqdan keçəndən sonra Ukrayna istiqamətində hərəkət edən 41-ci atıcı polkun tərkibində Xar-

kov yaxınlığında düşmənlə üz-üzə gəlir. İlk gördüyü səhnələr dəhşətə gətirir. Hər tərəfin meyitlə dolu olduğu, ölüm-dirim mübarizəsinin getdiyi bir vaxtda, demək olar ki, polkun döyüşçüləri əsl hünər göstərirdilər. Şəmistan Kərimov da mərdliklə vuruşurdu.

Bir neçə ay idi ki, cəbhədə idi. Ardı-arası kəsilməyən düşmən hücumları nəticəsində neçə gün ac-susuz, yuxusuz qalan Şəmistan hər cür çətinliyə dözürdü.

Cəbhə epizodlarından birini belə xatırlayır: şiddətli vuruşmaların birində polkun döyüşçüləri faşistləri qovub səngərlərdən çıxarmışdılar ki, bu vaxt təpədə faşist pulemyotçuları döyüşçülərimizi güllə yağışına tutdular. Yerə yatmağa məcbur olduq. Vəziyyət getdikcə ağırlaşırdı. Çünki qaranlıq düşürdü. Geri çəkilən faşistlər bundan istifadə edib təpədəki pulemyotçularla birləşə bilərdilər. Vaxtı itirmək olmazdı. On iki komsomolçu qaranlıqda yola düşdük.

Azca bir ehtiyatsızlıq ölümə bərabər idi. Ayaqlarımıza ot sarımışdıq ki, səs çıxmasın. Sürünə-sürünə təpənin arxasına keçib faşist pulemyotçularını məhv etdik. Bunun nəticəsində polkumuz 30 kilometrədək irəlilədi. Bizim göstərdiyimiz hünər isə polk komandiri tərəfindən yüksək qiymətləndirildi. Ancaq növbəti hücum zamanı başımdan ağır yaralandım. Dörd ay hospitalda yatandan sonra yenidən cəbhəyə qayıtdım.

Qanlı-qadalı müharibə illərində dəfələrlə yaralanıb, hərbi xəstəxanalarda yatıb, ancaq müalicə olunduqdan sonra yenə də silahını əlinə alıb. Onun odlu-alovlu, məşəqqətli döyüş yolu Almaniyanın Oder çayına qədər uzanıb. Sinəsində parıldayan orden və medallar müharibə illərindən ona yadigar qalıb. 1946-cı ildə doğma kəndi Xaçınyalına qayıdan Şəmistan müəllim kənd camaatının, işlədiyi kollektivlərin dərin rəğbətini qazanıb. Kənd ağsaqqalı kimi böyük nüfuz sahibidir. Veteranın ən böyük arzusu budur ki, müharibə olmasın".

Əfsuslar olsun ki, nankor qonşularımız bizi istəmədiyimiz müharibəyə cəlb elədilər. Görünür, gənc yaşlarından bədənində müharibənin yaralarını daşıyan Şəmistan Kərimovun taleyinə ömrünün qürub çağında doğma dədə-baba torpaqlarından didərgin düşmək də yazılacaqmış. Ancaq bu qismət, bu tale, bu yazı təkcə Şəmistan müəllimin deyil, qaçqın-köçkün həyatı yaşayan bütün soydaşlarımızın tərcümeyi-halıdır. Kədəri sevincindən qat-qat çox olan bu tərcümeyi-halın davamını Şəmistan müəllimin ömür-gün yoldaşı, onun yoxluğuna alışa bilməyən Kəmalə xanımdan eşidirik:

– Mən Seyfəli kişinin qızıyam. Şəmistanın atası ilə mənim atam əmioğlu idilər. Şəmistan cəbhədə atası ilə bir yerdə olub. Atası təhsil almasa da, zəngin dünyagörüşü vardı, savadlılar savadlısıydı. Atası tez qayıdıb, özü

isə 5-6 il cəbhədə qalıb. Yaralanıb, hospitala düşüb. 1946-cı ildə müharibədən gəlib. Ailə qurmuşuq. Şəmistanla 60 ildən artıq müddətdə çox mehriban, heç bir ziddiyyətsiz, acılı-şirinli bir ömür yaşamışıq. 10 qız övladımız olub. Hamısının tərbiyəsinə, ailəsinə elim-obam yaxşı bələddir. Bir dəfə Sosial Təminat Nazirliyindən orta yaşlı bir nümayəndə gəlmişdi. O, gətirdiyi mükafatı mənə təqdim edərkən dedi ki, ana, həm kədərlənirəm, həm sevinirəm. Ona görə kədərlənirəm ki, bəlkə də hansısa arzunuz elə arzu olaraq qalıb. Sevinirəm ona görə ki, bir arzuya çatmaq üçün 10 qıza yüksək səviyyədə tərbiyə verib ailə sahibi etmisiz. Aslanın erkəyi-dişisi olmaz.



Ağzı dualı, dili bayatılı, həlim xasiyyətli nənə övladlarının, kürəkənlərinin və 50-dən çox nəvə-nəticəsinin əhatəsində özünü xoşbəxt hiss etsə də, Şəmistan kişinin yurd həsrəti ilə dünyadan köçdüyünü deyib kövrəlir. Belə məqamda təskinlik verməyə söz də tapmırıq, çünki bu mövzuda dilimiz gödəkdir.

Bu mövzuya tez-tez qayıtmalıyıq və qayıdacağıq da. Hələlik isə cənnətini bu dünyada qazanan türk kişisinin ömür səhifələrini vərəqləyirik. O kişinin ki, ömür-gün yoldaşı Kəmalə xanımla birlikdə 10 qız övladını böyüdüb boya-başa çatdırıb. Hər birinin öz istəkləri ilə ailə qurmasına xeyir-dua verib. Beləliklə, kürəkənlərinin timsalında 10 oğul da qazanıb. Elə bu səbəbdəndir ki, kürəkənləri ilə münasibəti həmişə ata-oğul doğmalığına çevrilib.

Şıxəli İslam oğlu Şıxəliyevin Şəmistan Kərimov haqqında necə məhəbbətlə danışdığını dinlədikcə bu doğmalığa bir daha əmin olduq:

– Şəmistan Kərimovun kürəkənləri içərisində ən böyüyü mənəm. Onun haqqında günlərlə danışsaq bəs eləməz. Birincisi, biz yaxın qohumuq. Kə-

malə xanım da, Şəmistan müəllim də anamın dosdoğma əmisi uşaqlarıdır. Tale elə gətirib ki, mən 1962-ci ildən Bakı şəhərində məskunlaşmışam. Sonra Şəmistan müəllimin böyük qızı Saray xanımla ailə qurduq. Daha da doğmalaşdıq, münasibətlərimiz yaxşılığa doğru dəyişdi, istiləşdi.

El arasında camaat ona imam-peyğəmbər deyirdi. Müharibədə çox ciddi bir yara almışdı, başının yan hissəsində böyük çökəklik əmələ gəlmişdi. “Kamsavat” etmək istəyiblər, razılaşmayıb. Deyib ki, cəbhə yoldaşlarıma çox öyrəşmişəm, yenidən mütləq cəbhəyə qayıdacam. Hərbi hospitaldan çıxandan sonra təzədən cəbhəyə yollanır və 1946-cı ildə ordudan tərxis olunur. Laçın rayonuna qayıdaraq müəllim, kitabxana müdiri, kənd sovetinin katibi, meşəbəyi və digər vəzifələrdə işləyib. Harada işləməsindən asılı olmayaraq kollektiv arasında sevilib. Yaxşı günlərinə Kəmalə xanımla birgə seviniblər, çətinliklərini də bir yerdə dəf ediblər. Şəmistan kişinin də, Kəmalə xanımın da əməyi dövlətimiz tərəfindən yüksək qiymətləndirilib, orden və medallarla təltif olunublar.

Qaçqınlıq dövründə Bakı şəhərinə üz tutdular. Müvəqqəti olaraq əvvəlcə bizim evdə, sonra 9-cu mikrorayonda və nəhayət Yeni Günəşlidə məskunlaşdılar. Şəmistan Kərimov indi cismən aramızda olmasa da, işıqlı xatirəsi daim bizimlədir. Elə bir gün olmur ki, o, yada düşməsin, xatırlanmasın.

Qızları Saray xanım, Yeganə xanım və Cəmilə xanım da atalarından böyük məhəbbətlə söhbət açırlar, belə bir atanın övladları olmaqdan qürur duyduqlarını deyirlər. Həm də ona görə qürur duyurlar ki, ata-analarının başını daim uca ediblər, heç vaxt onlara utanc gətirməyiblər. 10 qız övladı böyütməyin məsuliyyətini yaxşı anlayaraq valideynlərinin zəhmətlərini itirməyiblər.

Allah da sizin zəhmətinizi itirməz inşallah. Yəqin ki, Gülarə xanım, Solmaz xanım, Sevda xanım, Elyanə xanım, Təranə xanım və Sona xanım da atalarından eyni məhəbbətlə danışardılar. Sizi bu dünyada Kəmalə xanıma, Kəmalə xanımı sizə tapşıran Şəmistan Kərimovun ruhu haqq dünyasında qızı Almaz xanımın ruhuna qovuşub indi. Ruhları şad olsun!

Ya gec, ya tez hər birimiz haqq dünyasına qovuşacağıq. Bu dünyada isə qoruyacağımız dəyərlər var və bu dəyərlərdən ən dəyərlisi ailə dəyərləridir. Sizlərə nümunəvi bir ailənin ünvanını göstərdik ki, dəyərlərimizin qədrini bilək, kökümüzə-soyumuza sadiq qalaq. Unutmayaq ki, haqlı olaraq ailəni kiçik dövlət adlandırırlar. Kiçik dövlətlərimiz nə qədər monolit olsa, sevgi telləri ilə bağlansa böyük dövlətimiz də o qədər güclü, sarsılmaz olar. Güclü dövlət isə mükəmməl cəmiyyətlərə məxsus dəyərlərin əbədi ünvanıdır.

**Arif MƏMMƏDLİ**

## DOSTUM ŞƏMİSTAN KƏRİMOVA



Bir vaxt sən əsgər idin,
Mən körpə uşaq.
Səni səngər sıxırdı,
Mənim yerim yumyumşaq.

Sən əlində silah sürünürdün,
Düşmənləri salırdın qorxuya.
Üşüyəndə şinelə bürünürdün,
Həsrət idin yatmağa, yuxuya.

Sən qoruyurdun Vətəni,
Tuş olmasın deyə düşmən gülləsinə.
Mən arxayın yatırdım layla səsinə.
Sən qovurdun düşməni
Başına güllə çaxa-çaxa.
Mən yatırdım oyuncaqlara baxa-baxa.
Sən çalanda qələbəni, qaldırdım badəni.
Sənin o qayğılı günlərin qorudu
Neçə-neçə qayğısız böyüyən Mikayılzadəni!

***09.05.1990, Qalaaltı***

## VETERAN

Cavanlar, yol verin, veteran gəlir,
Siz onu görəndə qalxın ayağa!
O gələn məclisə ehtiram gəlir,
Nur yağır qədəmi dəyən torpağa.

Adi nişan deyil yaxasındakı,
İçində gizlənən hərblə döyüşür:
Həmin ordenlərin arxasındakı
Qəlpələr bağrını hey sancıb-deşir.

Ölümlə çarpışır bir əsgər kimi,
Ancaq öz dərdini açmır heç kəsə.
Sinəsi örtülü bir səngər kimi,
Çırpınan ürəyi düşüb qəfəsə.

Cavanlar, yol verin, veteran gəlir,
O da sizin kimi şux cavan olub.
Düşmənin yurduna od vuran gəlir,
Bir aslan biləkli pəhləvan olub.

O, sizi qoruyub siz doğulmamış,
Qoruyub gələcək nəslinizi də.
Sizin anaların toyu olmamış,
Yaşadıb onları, – demək sizi də!

O nələr görməyib davada, nələr?...
Çəkməyin o çəkən əzabı, dərdi.
Ona dəyməsəydi həmin qəlpələr,
Vətənin bağrına dəyə bilərdi.

Bəzən bulud kimi rəngi qaralır,
Dəstəyi sürtülmüş köhnə ağaca, –
Üçüncü əlinə söykənib qalır,
Döyüş dostlarıyla danışır qoca.

Danışır, sözləri həzin, ahəstə,
Nə onu eşidir, nə duyur onlar:
Dinc həyat bəxş edib torpağın üstə,
Torpağın altında uyuyur onlar.

Duyun qəlbindəki o keşməkeşi,
Cavanlar, yol verin, veteran gəlir!
Zülmətin cəngindən alıb günəşi,
Dünyaya təzədən qaytaran gəlir!

Onu öldürməyib düşmən gülləsi,
Soyuq baxışınız öldürə bilər.
Ona etinasız baxan bir kəsi
Çətin ki, bu həyat güldürə bilər.

Nə pul möhtacıdır, nə çörək acı,
Bəsləyib nazını çəkən dövlətdir.
Ağsaqqal – bir elin başının tacı,
Hər günü sizlərə bir qənimətdir.

Mərdliyi, hünəri ondan öyrənin,
Bir canlı kitabdır, – ulu, müqəddəs.
Öyrənin, ürəkdən, candan öyrənin,
Məsləki müqəddəs, yolu müqəddəs.

Onun qədəminə gül-çiçək düzün,
Hərbin ağrısı var ayaqlarında.
Səngərdən-səngərə o, dizin-dizin
Sürünüb Avropa torpaqlarında.

Ucalıq gətirib öz diyarına,
Biz onu dağ bilib baş əyməliyik.
Döyüşən bir nəslin yadigarına
Qızıl bayraq bilib baş əyməliyik.

Cavanlar, yol verin, veteran gəlir,
Gəlir igid Babək, qoca Koroğlu!
Davanın səsini batıran gəlir,
Göyləri çiyninə alan Yer oğlu
Qaqarin nəslini yetirən gəlir!
Gəlir Vətənimin xilaskar oğlu,
Sizi bu dünyaya gətirən gəlir!

**Tofiq BAYRAM**

**MÜƏLLİM ÖMRÜ**

## LƏYAQƏTLİ İNSAN, QAYĞIKEŞ ANA



Əgər insan özünü həyatdakı bütün canlıların ən şərəflisi və kamili hesab edirsə, necə insanlıqdan kənar hərəkətlərə yol verə bilər? Biz insanıqsa, insanlığa çatmadan Allahı necə axtara bilərik? İnsan olmaq o deməkdir ki, bütün hərəkətlərinə cavabdeh olduğunu hiss eləsin. Təbii ki, insanlar özlərinin yaxşı və pis əməlləri ilə yadda qalırlar. Hər kəs müəyyən müsbət xüsusiyyətlərə malik insanları sevə bilər. Mənim insanlarda ən çox xoşladığım keyfiyyətlər mülayim və gülərüzlü olmaqdır. Bu xüsusiyyətlər hər bir kəsdə, xüsusilə də müəllimlərdə olanda daha gözəl olur. O müəllimlərdə ki, onlar şəxsiyyət yetişdirmək kimi çətin və şərəfli bir vəzifəni öz üzərlərinə götürürlər. Səbir və mülayimlik müəllim üçün çox önəmlidir. Dahi Nizami Gəncəvi yazır:

*Səbri, hövsələni unudan insan*
*Ağıldan, şüurdan açmasın dastan.*

Səbir yoxdursa, deməli, ağıl da yoxdur. Ağıl yoxdursa, onda başqalarının məsuliyyətini üzərinə götürməklə səhvə yol vermiş olursan.

Çox sevinirəm ki, hələ bu dünya, yaşadığımız bu həyat belə insanlardan xali deyil.

On iki ildir ki, Laçın rayonunun 7 №-li tam orta məktəbində müəllim işləyirəm. Mən bu kollektivdə çalışan gözəl, mehriban bir insan – məktəbimizin biologiya müəllimi Şahxanım müəllimdən söhbət açmaq istəyirəm. Nədənsə həmişə bu qadının nurlu çöhrəsinə baxanda özümü çox rahat hiss edirəm. Həyat eşqim, yaşamaq həvəsim artır. Bütöv bir ömür yolunda qürurla addımlayan bu qadın çox sədaqətli həyat yoldaşı, mehriban və qayğıkeş anadır. Ana adı, əlbəttə, daim uca tutulub. İllah da mənəvi saflıq və əxlaqi gözəllik bu ananın varlığında cəm olanda o daha çox sevilir və ucalır. Üç övlad böyüdüb cəmiyyətə nümunəvi şəxslər kimi verən bu ananın bütün həyat yolu elə bizlərə bir nümunədir. Nəinki övladlarına, hətta bütün dərs keçdiyi şagirdlərinə də öz şəfqətindən pay verir, öz peşəsini onlara çox səbirlə, təmkinlə öyrədir. Gözümüzün qarşısında belə ibrət götürüləsi, dəyərli insanlar varsa və onlar bizim üçün gözəl örnəkdirlərsə, biz nə üçün onları sevməyək, həyatda onlar kimi yadda qalmağa çalışmayaq?

Həyatda hər şeyi gözəl görmək istəyirsənsə, gərək, gözəl baxasan. İçində sevgisi olmayan insan necə gözəl ola bilər? Çünki insanı mənən təmizləyən, saflaşdıran, hər kəsdən güclü edən onun insanlara qarşı olan sevgisidir.

Ən yazıq və acınacaqlı insanlar sevmək qabiliyyətindən məhrum olanlardır. Ulularımız həmişə deyiblər ki, qəzəb, kin, paxıllıq insan üçün ən böyük qəbahət sayılır. Bütün bu hisslər xoşbəxtliyin qənimidir. İnsan çalışmalıdır ki, ən çətin məqamda öz təmkinini qorusun. Mən deyərdim ki, bu qadının üzündəki mülayimliyin bircə dəfə qəzəblə ifadə olunduğunu görməmişəm. Qəlbi sevgi və mərhəmətlə dolu belə insanların yanında adam özünü çox rahat, bütün problemlərindən uzaqda hiss edir. Bax belə bir insan olmaq, başqalarına xoş ovqat bəxş etmək xoşbəxtlik deyil, bəs nədir? Xeyir fikirli, xoş niyyətli insan olmaq hər kəsin işi deyil. Qəlbində doğmalarına, ətrafındakı insanlara qarşı sevgisi olan şəxs heç vaxt pis insan ola bilməz.

Mən Şahxanım müəllimə cansağlığı arzulayır, bütün həyatında müvəffəqiyyətlər diləyirəm.

Belə bir aforizm var: *"Ləyaqətli insan o adam deyil ki, qüsurları yoxdur. Ləyaqətli insan o insandır ki, ləyaqəti var"*.

Son sözlərimi bu ləyaqətli insana həsr etdiyim bir şeirlə bitirmək istəyirəm:

Üzünüz işıq dolu,
Qəlbiniz şəfqətlidi.
Yaxşı insan həmişə,
Hər yerdə hörmətlidi.

Bu həyatın dərsini,
Sizlərdən alırıq biz.
Bizə daim gözəllik,
Mərhəmət öyrədirsiz.

Layiqli anasınız,
Həm də gözəl müəllim.
Bu sözləri mən sizə,
Bəs necə söyləməyim?

Tanrı sizi qorusun,
Kədər nədir bilməyin!
Arzumdur bu zirvədən,
Bircə pillə enməyin!



**Ziyafət HƏŞİMOVA**

**POEZİYA**

**Zakir ŞƏHRİYAZ**



## QOŞA QAFİYƏLİ QOŞMA

Hər şeyi qatmayaq biri-birinə,
Ayaq ayrı şeydi, baş ayrı şeydi.
Görünəni düz yazaq, düz yerinə,
Ocaq ayrı şeydi, daş ayrı şeydi.

Hicran bizi yandırandı, yaxandı,
Sevincimiz uzaqlardan baxandı.
Biri görünəndi, biri axandı,
Yanaq ayrı şeydi, yaş ayrı şeydi.

Şəhriyaz, isməti çölə atmayaq,
Əttökən sözləri elə satmayaq.
Dərindən düşünüb qoşa tutmayaq,
Dodaq ayrı şeydi, qaş ayrı şeydi.

## ƏVVƏL-AXIR QOŞMA

İncə ürək səni sevib, bəyəndi,
İlin təzə gələn baharı kimi.
İlahi qüdrəti payımı verdi,
İşlək sərrafların bazarı kimi.

İstəyim mənimlə yola getmədi,
İlqarı unutdu, dada yetmədi.
İkicə kəlməni qəbul etmədi,
İncimiş ürəyin qubarı kimi.

İbadət eyləyib Haqqı səslədi,
İşi tərsə düşüb qeyri kəslədi.
İllərlə Şəhriyaz onu bəslədi,
İnci xəznəsinin ləl, varı kimi.

## ZƏNCİRLƏMƏ QOŞMA

Tanrım nə veribsə şükür etmişəm,
Gül deyəni bəzəmişəm təbimlə.
Hara deyiblərsə ora getmişəm,
Gəl deyəni bəzəmişəm təbimlə.

Təbim incidərmi məni duyanı,
Dostu sirdaş bilib yoldaş sayanı.
Sərraf olub sözə qiymət qoyanı,
Ləl deyəni bəzəmişəm təbimlə.

Təbim coşmaz ümmanlarda üzmədən,
Yaylaqları xəyalımla gəzmədən.
Şəhriyazam, yorulmadan, bezmədən
El deyəni bəzəmişəm təbimlə.

## GÜLLÜ QAFİYƏ

Dedim: gözəl, gözün yaman süzgündü,
Dedi: göz mənimdi, ondan sənə nə.
Dedim: yanaqların nədən qızarıb,
Dedi: üz mənimdi, ondan sənə nə.

Dedim: o günlərin gəlirmi yada,
Dedi: çox gözlədim, gəlmədi səda.
Dedim: nə yandırıb səni bu oda,
Dedi: köz mənimdi, ondan sənə nə.

Dedim: Şəhriyazın eldə oxundu,
Dedi: sən gördüyün keçmiş yuxundu.
Dedim: bu tərsliyin mənə toxundu,
Dedi: söz mənimdi, ondan sənə nə.

NƏSR

# GƏNCLİYİNİ AXTARAN ADAM

Ətrafa yayılan səs-küy, hay-haray onu fikirlərindən ayırdı. Mənzil başına çatmışdı. Keyimiş ayaqlarını sürüyə-sürüyə avtobusdan düşdü. Dərindən nəfəs aldı. Buraları ilk dəfə görürmüş kimi, diqqətlə gözdən keçirdi. Hər şey dəyişmişdi. Adam və maşın əlindən tərpənmək mümkün deyildi. Sanki qarışqa qaynaşırdı. Avtobuslar da ağzınacan adamla dolu idi; əyləşənlərin çoxu başlarını aynaya söykəyib, gözlərini yummuşdular. İlk baxışdan, simalarındakı ifadəyə əsasən, düşünmək olardı ki, onları buraya zorla dürtüblər və "gedər-gəlməz"ə yollayırlar. Hamının üzündə kədər, hərəkətlərində yorğunluq hiss olunurdu. Elə bil, harasa tələsirdilər, kimsə qovurdu onları. Yerdəki və küləyin havada uçurduğu zir-zibil isə bu görüntüyə yeni bir rəng qatırdı. Şəhər bu vəziyyətdə – öz sakinləri və zibilləriylə birlikdə əldən düşmüş, pinti, cır-cındır içində itib-batan, ömrünün son günlərini yaşayan kimsəsiz, xəstə qocaya bənzəyirdi. Maşınların tüstüsü, yanmış ət qoxusu bir-birinə qarışmış, avazı bəlli olmayan musiqinin gur səsi aləmi başına götürmüşdü. Yolun kənarındakı balaca dayanacağın hər iki tərəfində böyük aptek tikilmişdi. Vaxtilə bu dayanacağın yanında gül-çiçək mağazası və qəzet köşkü vardı. Rəngbərəng güllərə, çiçəklərə baxmaqdan doymaq olmurdu, ətirləri ətrafı bürümüşdü. Yolun o tayında isə qəzet köşkü, ətriyyat və kitab mağazası yerləşirdi. İndi onların da yerində balaca dayanacaq, onun bir yanında böyük aptek, digər yanında isə üzərinə kömürlə kobud şəkildə "Dönər" yazılmış, görkəmi o qədər də yaxşı təsir bağışlamayan balaca bir koma görünürdü. Komaya güclə sığışan, əynindəki his və yağ ləkəli köynəyindən daha çox çirkabla işləyən fəhləyə oxşayan yekəqarın kişi əlindəki uzun, qılınca oxşayan xəncərlə önündəki fırfıra kimi fırlanan ütülmüş ət topasının üzünü soyub o biri əlində tutduğu çörək parçasının arasına doldurmaqla məşğul idi. Buradakı yeniyetmə və gənclər isə heç nəyin fərqinə varmadan, verdikləri pulun müqabilində onun hazırladığı "dönər"ləri alan kimi, acgözlüklə yeməyə başlayırdılar. Komanın o tərəfindəki yaşıllıq zolağının yerində – elə yolun qırağındaca, toza-tüstüyə bürünmüş masaların ətrafında əyləşən adamlar, sanki dünyadan xəbərsizcəsinə, öz keflərində idilər, – çay içən kim, çörək yeyən kim... Camaatın davranışında və geyim tərzində bir neçə il əvvəl mövcud olan şəhər mədəniyyətindən əsər-əlamət belə qalmamışdı. Tüstü dumanı arasından çətinliklə sezilən arxa mənzərə də ürəkaçan deyildi: doqquzmərtəbəli binanın birinci mərtəbəsindəki mağazanı indi "Tibb mərkəzi" eləmişdilər. Apteklərdə olduğu kimi, oraya da girib-çıxanlar çox idi (bir anlıq ona elə gəldi ki, buradakı adamlar xəstədirlər və elə müalicə almaq, şəfa tapmaq üçün buraya gəliblər). Sağ tərəfdəki növbənöv mineral sular və müxtəlif mey-

və şirələri satılan balaca "köşkü" isə "puldəyişmə məntəqəsi" əvəz etmişdi. Sol tərəfdəki mədəniyyət ocağının – klubun uçulub-sökülmüş görkəmi, bir vaxtlar buradakı göz oxşayan parkın yandırılmış cəngəlliyə bənzəyən mənzərəsi uzun illərdən qalmış xarabalığı xatırladırdı...

Çox sıxıldığını hiss elədi. Dönüb, tezliklə buranı tərk etməyi qərara aldı. Pillələrlə aşağı endi. Üzbəüz binanın birinci mərtəbəsindəki böyük univermağın yerini "Mebel mağazası" tutmuşdu. Ömrünün ən bakirə çağlarında buradan dəftər-qələm aldığı vaxtlar xəyalından keçdi... Binanın tinindən dönərkən, bir qədər duruxdu. Qarşıdakı tramvay yolunun yerində yol boyu uzanıb gedən yanaşı tikilmiş mağazalar xoşagəlməz bir uyğunsuzluq, nizamsızlıq yaratmışdı. Tramvay çoxdan "başını götürüb qaçmışdı"... Təkcə ayağının altındakı səki öz görkəmində qalmışdı: bozarmış, səliqəsiz, çala-çökəyi ilə ona şirin gəldi. Şəhərin əvvəlki özünəməxsus qoxusu burnuna doldu. Bayaqkı üzüntünün yerini yenidən xatirələr aldı. O günləri düşündü... Növbəti binanın yanına çatanda qeyri-ixtiyarı dayandı. Bu ikimərtəbəli yaşayış binasının o qədər də böyük olmayan həyətində həmişə sakinlərdən kimsə samovar qaynadardı. Hər dəfə buradan keçəndə, o mənzərəyə baxar, duyğulanardı. İndi o tüstülənən samovar yox idi, həyət zibilliyə bənzəyirdi, binaların da rəngi bir qədər solmuşdu...

Hündür hasarın doğma, həm də qərib duyğular yaradan divarları da əvvəlki görkəmində idi. Sadəcə, onun da rəngi solmuşdu, çox nimdaş görünürdü. Hasarboyu addımladıqca ayaqlarının taqətsizliyini hiss elədi. Dayandı. Geri qayıtmaq istədi. Nə fikirləşdisə, yenidən yoluna davam etdi. Sağa burulub, qapıya yaxınlaşdı. Darvazanın şəbəkələri arasından tanış mənzərəni seyr etmək istəyirdi ki, elə bu vaxt qarşısında gülərüz, son dərəcə mehriban bir oğlan – gözətçi peyda oldu. Xüsusi qayğıkeşliklə: – Yəqin, siz də burada oxumusunuz? – deyə, soruşdu və cavab gözləmədən, özünün də bu məktəbi bitirdiyini söylədi, keçmiş məzunların tez-tez buraları ziyarət etməyə gəldiklərini dedi. Bayaqkı üzüntülərin fonunda bu cür isti qarşılanmağı onu ötəri də olsa, sözlə ifadə edə bilməyəcəyi məmnunluğa qərq etdi. Gülümsədi, təşəkkürünü bildirib, içəri – həyətə keçdi. Tətil vaxtı və axşamüstü olduğundan, orada başqa heç kəs yox idi. Gözətçi onu xatirələrlə baş-başa buraxdı...

Hər şey köhnə, hər şey keçmişdə olduğu kimi; həmin asfalt örtük, həmin skamyalar, həmin qoxu... Qapıdan girən kimi diqqəti cəlb edən, üzərinə dahilərdən birinin kəlamı yazılmış böyük lövhənin yeri indi boş qalmışdı. Oradakı – qarşısında balaca hovuz olan su kranını açdı. Suyun axdığını görüb sevindi. Əyilib, əl-üzünü yudu, su içdi. Ürəyinin yanğısı bir qədər azaldı. İrəli addımladı, ətrafı seyr etdi. Gəlib, tanış bir skamyanın yanında dayandı. Diqqətlə oraya baxdı. Sanki bu dəqiqə həmişə burada əyləşib kitab oxuyan oğlanı – arzuları aşıb-daşan, gələcəyə həvəsli, ümidlərinin ətəyindən

möhkəm yapışan o inadkar, çalışqan, qaynar təbli, hamını doğma bilən, hər kəsə yaxın olan, mehriban, qayğıkeş qara saçlı yeniyetməni görəcəkdi. Biixtiyar əyləşdi, əlini havada yellətdi. Ona elə gəldi ki, indi həmin oğlanın yanında əyləşib, onun saçlarını tumarlayır. Hətta onun nəfəsini, ürəyinin döyüntüsünü belə eşidirdi. Dodaqları tərpənir, nəsə danışırdı – söhbət edirdi. Uzaq kəndlərin birindən buraya gəlmiş, qaynar şəhər həyatına düşən bu oğlanın çöhrəsindən bir məğrurluq, saflıq, sadəlövhlük oxunurdu. Nəfəsində kənd ətri vardı. Baxışlarında ayrılıb gəldiyi dağların əzəməti, vüqarı canlanırdı. Qəlbinin aynası olan gözləri də daşların arasından süzülüb gələn bumbuz bulaqların dumduru, saf sularını xatırladırdı. Buraya gəlmək çoxdankı arzusu olsa da, birdən-birə bu süni şəhər mühitinə düşməyi ona heç də yaxşı təsir bağışlamamışdı. İlk vaxtlar çox darıxmışdı. Qarşısına qoyduğu məqsədə çatmaq istəyi olmasaydı, çoxdan dönərdi kəndə. Amma, yolun yarısından qayıtmağı özünə sığışdırmamışdı. Düşünmüşdü ki, bu çətinliklər müvəqqətidir və yavaş-yavaş hər şey öz qaydasına düşəcək. İlk dəfə burada görmüşdü insanların paxıllığını, saxtakarlığını, ikiüzlülüyünü, yaltaqlığını, burada anlamışdı həyatın yaşamaq uğrunda mübarizədən başqa bir şey olmadığını. Ziddiyyətlərlə dolu bu yaşam tərzini çətin də olsa, qəbul edib, ona davam gətirməyə məcbur olduğunu dərk etmişdi... Canındakı qələbə ruhuydu onu yaşadan, irəli aparan.

Gecə-gündüz var gücüylə bu qələbəyə çalışırdı. Heç kəslə "işi olmayan", ürəyitəmiz biri olduğu üçün onunla sirdaşlıq edən yaxşı yoldaşları da az deyildi. Hərdən, meydana çıxan mübahisələri də yoluna verməyi bacarırdı. Onunçün insanlıq hər şeydən uca idi. Savadın, elmin, təhsilin varsa, deməli kiməsə gərək olacaqsan, səni axtaracaqlar, yaşamaq səninçün heç vaxt çətin olmayacaq, yalnız Vətəninə, xalqına xidmət etməklə – şərəfli həyatınla başqalarına da nümunə olacaqsan, deyə düşünmüşdü. Elə bilirdi ki, "halallıq" hamının amalıdır, hamı halallıq naminə elm oxuyur, savadlı olmağa can atır. Bu hisslər sonrakı ali məktəb illərində də onu tərk etməmişdi...

Yaxşı ki, ətrafda heç kəs yox idi, onun göz yaşlarını görən olmadı. Nədənsə, çox kövrəlmişdi. Alt-üst olan həyatınamı acıdı, heçliyə qovuşan o ümidlərin puç olduğunumu düşündü, yoxsa, o məsum gəncə gələcək fəlakətlərdən xəbər verdiyinəmi peşman oldu, bilmədi. Sarsıldı. Bütün gücünün tükəndiyini hiss elədi, qəhərləndi, vücudu titrədi. Ayağa qalxdı. Bir az tutuldu, ətrafa boylandı... Üz-gözündən köhnəlik yağan, şüşələri qırılıb-tökülmüş, içərisinin də əvvəlki təravəti itmiş oranjereyanın (şitilxana) yanındakı qapıdan keçərək, bir qədər təbii meşəliyi xatırladan ağaclığı görmək istədi. O görkəmdən əsər-əlamət qalmamışdı. Ağacların çoxu kəsilib götürülmüş, yerində qalanları quruyub əldən düşmüş, bağın əsas hissəsində isə üzü çöl tərəfə böyük bir bina tikilmişdi. Cadar-cadar olmuş torpaq buralara çoxdan

su axmadığından, insan əli dəymədiyindən xəbər verirdi. Bir vaxtlar gəzib-dolandığı yerlərin bu hala düşməyi, xatirələrinin kökündən qazılıb itirilməyi – bu cansıxıcı mənzərə ona əzab verdi. Geriyə qayıtdı.

O, gənclik təravətli, gülərüz oğlanın əyləşdiyi skamyanın qarşısından keçib, sola buruldu. Bir daha peşman halda məktəb binasının qarşısında dayanıb baxdı. Bu dəfə başqa bir duyğu onu çulğaladı: həyatında ilk dəfə gördüyü gözəlliyin, duyduğu səmimiyyətin təsirindən qəribə vəziyyətlərə düşdüyü günləri xatırladı. Sanki elə indicə doğma, gülümsəyib baxan o simanı görəcəkdi...

Heç vaxt hisslərə bu qədər qapılmamış, inanmamışdı. Bu gün isə əməllicə əsiri olmuşdu təzadlı duyğuların.

Arxaya döndü. Acılı-şirinli xatirələr içərisində xüsusi yeri olan, indi xeyli sönük görünən yeməkxananın ətrafını həsrətlə dolanıb, yataqxanaya baş çəkdi. Həmin o yeniyetmə ilə bir daha “qarşılaşmamaq” üçün orada çox dayanmadı. Amma hiss olunurdu ki, hər addımda əvvəlki izlərini axtarır vaxtiylə gəzdiyi, əyləndiyi yerlərdə.

Yataqxananın arxa tərəfində vəziyyət daha qəmgin idi: əvvəllər məktəbin tibb məntəqəsi olan bu hissədə həyatı, yurd-yuvası vəzifə, mal-mülk dəllalları tərəfindən hərraca qoyulmuş, düşmənlərə satılmış, zəngin keçmişi, şanlı tarixi, dəyərli şəxsiyyətləri, ziyalıları ilə tanınan böyük bir elin, səfil görkəmli məktəbi yerləşirdi. Məktəbin bu miskin siması ona öz halının güzgüdəki əksi kimi təsir bağışladı. Qopa bilmədi bu acı hisslərdən; illərdən bəri çəkdiyi əzab-əziyyət, didərginlik, həyatının tarmar edilməyi, keçmişi, bu günü, gələcəyi işğal olunaraq əldə oyuncağa çevrilmiş bir məmləkətin ömrü-günü talan edilmiş günahsız adamları, onların taleyi, həyatı, kəsilən “başları”, sındırılan “dizləri”, gözüyaşlı körpələrinin üzündəki üzücü ifadə yenidən canlandı gözlərinin önündə. Qəfildən çilik-çilik olub ətrafa səpələndi həmin güzgü. Parçalarının üzünə toxunduğunu, sifətini yaraladığını hiss etdi. Bir anda qırmaq, dağıtmaq istədi hər şeyi, ucadan bağırmaq istədi, axtardığını tapmaq, görmək istədi. Amma bacarmadı. Başını əlləri arasına alaraq, divara söykəndi və dondu...



Hava qaralırdı. Əsən külək yağış yağacağından xəbər verirdi. Tozanağa qərq olmuş küçəylə bir adam ağır-ağır addımlayırdı. O, artıq heç nə düşünə bilmirdi. Hətta haraya gedəsi olduğunu da unutmuşdu...

**Namiq ZAMAN**

**POEZİYA**

**Baloğlan QƏZALI**



## DOLANAM BAŞINA

Tale quşu olam uçam,
Qonam Laçının qaşına.
Olam pərvanə, dolanam
Qızıl Qayanın başına.

İsa sevən oylaqların,
Zülal buzlu bulaqların.
Yenə gələ qonaqların
Arxud bulağının başına.

Çəkilə çən, kəsə dolu,
Açıla xalqımın yolu.
Qırat üstə Qoç Koroğlu –
Vura düşmənin başına.

Sərkərdə qolu qüvvəli,
Həcər xanım, Qaçaq Nəbi.
Qeybdən gələ qəzəbli –
Dolanam Əlinin başına.

Kalafalıq, Qaraqaya –
Ordumuza arxa dura.
Yaylaqlar bələnə gülə,
Dolanam elin başına.

Təzə dilə gələ bülbül,
Şadlanıb oxuya hər dil.
Qurban ola xarıbülbül,
Dolana Şuşanın başına.

Şəlvə dərəsidi bəlli,
Əhliyyət – Qənəhət elli.
Kürdoğlu – Məhəmməd selli
Qan qatıb bulaq yaşına.

Baloğlan qocalıb bəlkə,
Ya görə, görməyə bir də?
Bir gül ilə solmaz ölkə,
Yaz məzarımın başdaşına,
Dolanım Vətən başına.

## DAĞLAR

Zirvəsində qar var, quzeyində gül,
Aşarammı üstündən o yana, dağlar?
Bəlkə bəxtim yatıb, yoxdur xəbərim,
Qoyma bəxtim yata, ay ana dağlar.

Murovdan başlayır Kəpəzə sarı,
Ağ xələt geyibdir, yağıbdır qarı.
Ya nəsib, ya qismət kim görə barı,
Nə dalıb sükuta, xəyala dağlar.

İldırımın qopub, göy guruldamır,
Şimşəklərin çaxmır, çırağın yanmır.
Yapıncın qeyb olub başından baxmır,
Meh əsib aparıb hayana, dağlar.

Tarix yaranmamış yaranıb özü,
Dastanlara süzüb bal kimi sözü.
Fəsillər dolanıb, dönməmiş üzü,
On iki ayların yay ola, dağlar.

Gənclik vaxtım Qazandurmaz dağıdı,
Saqqala ağ yağan Murov qarıdı.
Qəzalı Baloğlan el vurğunudu,
Yaxşı dostu salma kənara, dağlar.

## QARDAŞIM XANIŞA

Şeir 1958-ci ilin payızında Zori Balayanın qardaşı, Dağlıq Qarabağda kökəltmə birliyinin baş direktorunun ölümüylə bağlı Ağdərədə 23, Xankəndində 1 gün güllə altında yatdığım müddətdə yazılıb. Hadisə Ağdərə rayonunun Madagiz-Çaylı ərazisində (Mübariz İbrahimov qəhrəmancasına həlak olan ərazi) baş vermişdir.

*Laçında oğullar tanıyıram ki,*
*Erməni qarışıq Ermənistanı*
*Tutub qayalardan ata bilərdi.*
***Zəlimxan YAQUB***

Bu bir nahaq qandı, düşmüşəm oda,
Xalq açar qapımı, qardaş, ağlama.
Yerdə, göydə, ərşdə, kürşdə, havada,
Pərvazlanıb bəxtim uçar, ağlama.

Tərsə yazıb dağda qəza qələmi,
Dolanır dünyanı, gəzir kəməndi.
O zaman yatmışdı Cənabi Əli,
On iki imamlar açar, ağlama.

Səbri çox genişdir, tələsmir özü,
Deyəcək hakimlər doğru, düz sözü.
Çək toqqanı bərkit, silmə çüt gözü,
Sallayıb qurşağın çəkər, ağlama.

Hər kəs vədəsində yenib ucalar,
Qocalar məhv olar, cavan qocalar.
Xainin arzusu ürəkdə qalar,
Bu yurddan o yurda köçər, ağlama.

Belə yazıb zəmanənin qələmi,
Bəd gəlib ömrümün əsir küləyi.
Bahar gələr, açar gülü, çiçəyi,
Axır şərbətini içər, ağlama.

Hanı o Baloğlan, görünmür özü,
Dolanır dünyanı şöhrəti, sözü.
Yaxşı dost yanında deyər düz sözü,
Xaliq işıq verər, qardaş, ağlama.

***1958-ci il***

## QANANLARDANAM

Ustad alimlərin dürlü sözündən,
Səri zərlə dolu qananlardanam.
Ələsgər, Qurbani, Şəmşir, İmanı
Hər vaxt yada salıb ananlardanam.

Yol yoldaşıyam Şirin, Fərhadın,
Leylinin, Məcnunun, dərdin, fəryadın.
Üstünə götürüb Qəzalı adın,
Nəcəf, Kərəm kimi yananlardanam.

Nizami, Füzuli, Xəqani hanı,
Xəstə Qasım, Hafiz Mirzə, Sənani.
Molla Cüma, Xəstə Qasım kamallı
Dərin şairləri ananlardanam.

Vətən oğlu Bəhmən eldə bəllidi,
Dağlar oğlu Kəlbəcərdə Əlidi.
Dəlidağlı Əli Başlıbellidi,
Şəhdi şəkər Vurğun sananlardanam.

Vallah Sücaəti dərin düşünən,
Zəlimxan Yaqubu anlayan, bilən.
Koroğlu qalasın axıra hörən,
Qəhrəman dastanlar bilənlərdənəm.

Nə aşiq deyiləm, nə də ki şair,
Yaxşını yamandan seç təmiz, ayır.
Baloğlan vəzifəni, pulu heç sayır,
Uzaq, gendən durub baxanlardanam.

**Təqdim etdi: Vaqif QULİYEV,**
*Sumqayıt Şəhər Gənclər və İdman*
*Baş İdarəsinin baş məsləhətçisi*

DÜNYA ƏDƏBİYYATI

Robin ZİGER

# ZƏFƏR ÜÇÜN DOĞULANLAR
(davamı)

## KONKRET HƏDƏFLƏR

***Həyatın faciəsi bir insanın məqsədlərini gerçəkləşdirə bilməməsi deyildir, gerçəkləşdirəcək hədəflərinin olmamasıdır.***

**Tsayya Meyz (İsaiah Mayes)**

Balaca uşaqlardan böyüyəndə nə etmək istədiklərini soruşduqda bunu sizə deyərlər. Onlar üçün çeynənmiş "bilmirəm" sözü hələ mövcud deyildir. Ən böyük qəhrəman olmağa can atar və yaxud da kosmonavt olmağı seçərlər, zira zehinlərində qarşılarına düzülmüş məsləklərin və peşələrin heç bir sərhədi yoxdur.

Fəqət bir az böyüdükləri zaman, məktəbi bitirdikdə nə edəcəklərini soruşarsınız, əksəriyyəti bunu bilməz. Məktəb dövrü bitdikdən çox-çox sonralar belə bəzilərimiz bu suala cavab verə bilmirik.

Konkret bir hədəfin olmaması qeyri-müəyyənliyin başlıca səbəbidir. Qeyri-müəyyənlik şəxsi səviyyədə özündənrazılıqdan özünəinamsızlığa və içi saran böyük bir narahatçılığa qədər cürbəcür duyğular yaradır.

Bir fokus nöqtəsini diqqətlə seçməliyik. Rəqabətli iş mühitində şirkətlər özlərini qısa müddətdə həyatda qalmağa fokuslayırlar. Bu, onlara baha başa gələ bilir. Keçən əsrin əvvəllərində yüz əlli illik ticarət həyatından sonra Amerikanın ən ilk şirkətlərindən biri fəaliyyətinə son qoydu, çünki avtomobil istehsalının artması ilə insanlar artıq at arabası almaq istəmirdilər. Bu firmasa məhsullarını dəyişmək, yəni at arabaları əvəzinə avtomobillər istehsal etməkdənsə həyatda qalmağı qət etdi və belə etməklə də başlarını ölüncəyədək quma gömmüş oldu.

Bunun əksinə, öz sahələrində indi devləşib azmanlaşmış şirkətlərdən bəziləri – Komatsu, Kanon (Canon) və Honda kimi böyük firmalar özlərinə 20-30 illik hədəflər qoyaraq bu məqama çatdılar. Onlar gələcəkdəki çox uzaq bir nöqtəyə fokuslandılar və "filan tarixədək gedib çatmaq istədiyimiz yer buradır, biz o nöqtədə olmaq istəyirik" dedilər. Geniş iş sahələri ilə böyük bir holdinq olan Matsushitanın üç yüz illik bir planı vardır.

Gənc ikən bir çox istəklərimiz olur, fəqət yaşlandıqca çətin həyat şərtləri ilə bağlı olaraq bunları unuduruq. Gənclik xəyallarımız beynimizdən

silinib gedir. Bunların artıq gerçəkləşdirilə biləcək olmalarına inamımızı itiririk. Odur ki, işlərimizi çox vaxt sona çatdırıb tamamlaya bilmirik.

***Sizin özünüz haqqında nə düşündüyünüz başqalarının sizin haqqınızda nə düşündüyündən çox-çox daha önəmlidir.***

**Senaka**

Xəyallarınıza, muradınıza çatmaq üçün səy göstərin və rahatlıq bölgənizin hədlərindən kənara çıxın. Nə qədər kənara çıxacağınız özünüzdən asılıdır. Fəqət qəfəsə salınmış quş kimi, qapı açıldığı zaman, hədəfə çatanadək vaz keçməyəcəyiniz bir yolçuluğa başlamaq üçün özünüzə inanmalı və cəsarətli olmalısınız.

Gənc bir mürid, çayın kənarında mürşidi, ustası ilə birlikdə oturub ustasına uzun illər boyu ziyarət (məşq və təmrin) etdiyini, Tanrını kəşf edib bulmaq üçün aydınlatmağa, nurlanmağa çalışdığını, fəqət nurlanmışlığa heç yaxınlaşa belə bilmədiyini anlatmışdır. “Tanrını bulmaq üçün nə etməliyəm?” – deyə o, ustadından soruşmuşdur. Ustad bir sürə baxdıqdan sonra gənc adamın qafasını suyun altına soxub bir müddət orada saxlamışdır. Bir xeyli dəli kimi çırpınıb çabalayan gənc adam başını suyun üzərinə çıxara bilmiş və nəfəsi kəsilə-kəsilə “Niyə belə etdin?” – deyə gileylənmişdir. Ustadısa ona belə cavab vermişdir : “Varlanmaq arzun nəfəs almaq istəyin qədər böyük və şiddətli olanda hazır olacaqsan”.

Bu məsəl ruhi bir mənada anladılmışdır, ancaq bunun hər birinizə aidiyyatı vardır. Hədəfinizə çatmağı boğulan bir adamın nəfəs almaq istədiyi qədər çox istəməlisiniz. Qarşınıza qoyduğunuz hədəfə özünüzü bütün qəlbiniz və zehninizlə həsr etməlisiniz.

Bu məqsədə çatmağı nəyə görə istəyirsiniz? Bunun sizə gətirəcəyi faydalar nələrdir? Bu faydaların nə olduğunu anlamaq çox vacibdir, çünki hədəfləriniz sizi uğura, başarıya doğru götürüb aparar və ağır, çətin zamanlarda irəliyə getmənizi təmin edərlər.

1917-də Stokholmlu Qoran Kropp öz gücüylə Nepalo quru yolu ilə səyahət etməyi, heç bir dəstək olmadan Everest dağına oksigen balonu olmadan dırmaşmağı, sonrasa eyni yolla ölkəsinə qayıtmağı qət etdi. Bu çox böyük bir hədəf idi, həm də real görünə bilərdi. O, öncə bu marşrut üzrə səyahəti də öz içərisinə alan çoxlu fiziki məşq və təmrinlər etdi, sonrasa 200 000 funt sterlinq məbləğə başa gələcək bir böyük səfər üçün sponsor aramağa üz qoydu. Ürəyinin və qan-damar sisteminin möhkəmləndirilməsi üçün İsveç

xizək komandası ilə birlikdə məşqlərə başladı. Xüsusi qaydada düzəldilmiş bir velosipedlə yola düzəldi. Heç bir dəstək, yardım almadan bir səfərə çıxdığı üçün 129 kiloluq bütün ləvazimatını da özü daşımaq zorunda qaldı.

Dörd ay altı gün sonra o, Katmonduya (Nepal dövlətinin paytaxtına) çatdı. Oradakı ləvazimatını baza olacaq bir düşərgəyə daşıdı. Yetmiş kiloluq yük orada on dəqiqəlik dincəlmə ilə bir dəfəyə yalnızca əlli metr məsafəyə aparıla bilirdi. O, ilk dəfə idi ki, hədəfinə çata biləcəyi sarıdan ciddi bir şübhəyə düşmüşdü. Göstərmək zorunda qaldığı səyin həyatının ən yorucu fiziki sınağı olduğu bəlli idi.

Üçüncü təşəbbüsündə zirvəyə çatdı, sonra dağdan endi, velosipedinə mindi və İsveçə qədər 12 000 kilometr boyunca pedal hərlədi. Ayrıldıqdan bir il səkkiz gün sonra ölkəsinə döndü.

Məqsədlərimiz bizə və başqalarına da ilham verir. Onların ortaya qoyduqları şövq və coşqunu hiss edərik və bu, bizə bir güvən şəklində geri dönər. Gəlin məqsədlərimizə layiq olaq və onlarla qürur duyaq. Onların bizə, çevrənizdəkilərə və ümumən topluma yararlı olmalarını təmin edək.

***Aldığımızla yaşamımızı sürdürür, verdiyimizlə bir yaşam yaradırıq.***

**Ser Vinston Çörçill**
**(1874-1965)**

Fəqət bu məqsədə çatmağı elə çox istəməlisiniz ki, nə şövqünüz, niyyətiniz bir an belə tərəddüd etməməlidirlər. Sizi məqsədinizə doğru gedən yoldan sapmağa qoymayan şövqünüz və niyyətinizdir.

1950-lərdə Yeyl (Yall) Universitetində 1500 tələbəyə bir anket forması göndərilmişdir. Mövzular tələbə aşxanasındakı yeməklərin keyfiyyətindən tutmuş kitabxanaların nə dərəcədə çatımlı olduğuna qədər fərqli idilər. Burada son iki sual daha maraqlı idi: “Həyatınızda çox istədiyiniz bir şey varmı?” və “Bunu heç yazıya aldınızmı?”.

İyirmi beş il sonra bu anket formasına rast gələn bir universitet məzunu bu iki sualla bağlı bir araşdırma aparmağa qərar verdi. 1500 tələbədən 75 faizindən artığının həyatlarında çox istədikləri bir şeyin olduğunu, yalnız sadəcə 3,3 faizinin bunu yazıya aldığını ortaya çıxardı. Onlardan bir çoxunu o, arayıb tapdı və məqsədlərini yazıya almış əlli bir tələbənin şəxsi arzularını – ticarətdə, siyasətdə və cürbəcür məsləklərdə – gerçəkləşdirmiş olduqlarını gördü. Digərləri nail olmuş olduqlarının planlamadan daha çox bir şans işi olduğunu anlatdılar. Əksəriyyətinin nəticədə heç planlamadıqları bir

mənsəb və iş yerləri olmuşdu, çünki arzuladıqlarının nə olduğunu tam olaraq müəyyən etməmişdilər.

Məqsədinizi yazıya almanın beyninizi bir hədəfə aktiv olaraq proqramladığı və yenidən proqramladığı üçün çox effektli olduğuna inanıram.

Toyota loqo-da Yaponiyada 47 000 nəfərə iş verdi və bu insanlar da o il ərzində heyrətamiz bir miqdarda, 1.8 milyon təklif ortaya qoydular. Buradan o nəticəyə gəlmək olar ki, bu işçilər işin içində olmuş və özlərini bəyənilmiş, təqdir olunmuş hiss etmişlər. Və bu, onun rekord müddətdə çertyoj taxtasından sərgi salonuna çıxdığını, oradan da böyük bir rəqabətin hökm sürdüyü lüks avtomobil bazarında ilk sıraya keçən "Lexus" modelinin necə yaradıldığını açıqlamada açıq-aydın göstərəcəkdir.

Ölümündən qısa bir sürə öncə Albert Eynşteyn etiraf etdi: "Heç bir xüsusi qabiliyyətin olmadığını qəti bilirəm. Fikirlərin mənbəyi özünütənqidlə birləşmiş maraq, şövq və inadcıl bir səbirdir". Odur ki, fikirlərinizi bəsləyib təşviq edin. Əks halda işə başlamazdan öncə bir addım geriləmiş olarsınız.

Hər şeydən, hər kəsdən öncə özünə qarşı dürüst ol və bunu gecə gündüzü necə izləyirsə, o qədər dəqiq və dönməz şəkildə et. O zaman heç kəsə qarşı hiyləgərlik etməzsən.

**Vilyam Şekspir (1564-1616)**

**Hamlet. III pərdə, səhnə**



Əsla qorxmayın. Özünüzü uğursuzluqla eyniləşdirməyin. Böyük düşünün, kiçik başlayın. Bir şeyi həqiqətən etmək istədiyiniz zaman bir yol taparsınız, istəmədiyiniz haldasa tapdığınız bir bəhanə, "üzrlü" səbəb olacaqdır. Odur ki, xəyalınızı, arzunuzu indi çin etməyə, gerçəkləşdirməyə başlayın ki, iyirmi-otuz il sonra geriyə baxıb o şansa təkrar sahib olmağı istəməzsiniz. Fürsət əlinizdədir, ondan yararlanın.

***Səlcuq türkcəsindən uyğunlaşdıranı:***
**Yusif OTAYLI**

**POEZİYA**



**Elnur İRƏVANLI**

## ÇƏTİNDİR BURDA YAŞAMAQ

***(Mərhum şair Cabir Savalana)***

Çətindir burda yaşamaq,
Bəs ölmək orda necədir?
Ruhlar zülmətdən sıyrılıb
Parlasa nurda, necədir?

Çox deyilib, çox bu haqda,
Göy yaxındır, yer uzaqda.
Quzu adamlar torpaqda
Yem olur qurda, necədir?

Çoxları fənaya getdi,
Tikdiyi binaya getdi.
İbrahim Minaya getdi,
Bəs Musa Turda necədir?

Gülüşü dərd gülənlərin,
Örüşü yox ölənlərin.
Salamı var gələnlərin,
Gedənlər gorda necədir?

***15.02.2014***

## BU DÜNYA GÖZƏLDİR GÜLÜŞLƏRİNLƏ

***Bacım qızı***
***Səfərova Gülsüm Ramil qızının***
***2 yaşının tamam olması münasibətilə***

Bu dünya gözəldir gülüşlərinlə,
Yaşa öz ömrünü mənalı, Gülsüm.
Sevindir dayını, nənə, babanı,
Böyüyüb atalı, analı, Gülsüm.

Nə bir qayğın olsun, təlaşın olsun,
Xoşbəxtlik ömür-gün yoldaşın olsun.
Könlündə istəkli sirdaşın olsun,
Görək əllərini xınalı, Gülsüm.

Elnuram, bağçada bar deyil əbəs,
Həyata zinətdir həyatdakı kəs.
Qol aç, zirvələrə uçmağa tələs,
Görək səni bürclü, qalalı, Gülsüm.

***07.11.2014***

**ARAŞDIRMA**

## "QIZIL PALID"IN SORAĞINDA



Yetərincə yeraltı və yerüstü ehtiyatlarla zəngin, Azərbaycan Respublikasının cənub-qərbində, dağlıq ərazidə yerləşən Laçın rayonu 18 may 1992-ci ildə Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edildi. Biz bu işğal zamanı nələri itirmədik ki, bizlərə məxsus yer-yurdumuzu, vətəndaşlarımızı, maddi-mənəvi dəyərlərimizi, ideoloji, elmi təsir gücümüzü, informasiya, sosial sahələrimizi və s. Bütün bunlarla yanaşı bu ərazilərdə 20 ildən artıqdır ki, yüz illər ərzində əmələ gələn torpağın münbit qatı məhv edilir, flora və faunaya böyük zərər yetirilir. Müxtəlif vaxtlarda, müxtəlif ərazilərdə girovluqda olmuş Laçın Rayon Meşə Təsərrüfatı İdarəsinin fəhləsi Bəndəliyev Maşallah, Hacılar kənd sakini Bərxudar Rüstəmov və digərlərinin dediklərindən aydın olur ki, ermənilər yalnız dinc azərbaycanlılara qarşı deyil, həmçinin Qarabağ ərazisində qərarlaşan ətraf aləmə qarşı da terror siyasəti həyata keçirir. Bu gün də ayrı-ayrı mənbələrdən alınan məlumatlara görə, hələ də Hacısamlı meşələrinin flora və faunası dünya ekoloqlarının gözləri önündə saymazyana və amansızcasına istismar edilməklə məhv edilir. İşğal edilmiş bölgələrdə qızıl ehtiyatlarından sonra ən çox talanan sərvətlər arasında meşələr əsas yerlərdən birini tutur.

Məlumat üçün qeyd edim ki, qışı quraq keçən, soyuq iqlim tipi hakim olduğu Laçın rayonu üzrə 33285 hektar meşə fondu torpaqları vardır ki, bunun da meşə ilə örtülü sahəsi 26647 hektar idi. Meşələrdə ardıc, şam, palıd, dağdağan, vələs, göyrüş, ağcaqayın, qarağac, akasiya, qovaq, söyüd, dəmirqara, armud, alma ağacları üstünlük təşkil edirdi.

Ekologiya və Təbii Sərvətlər Nazirliyinin (ETSN) mətbuat xidmətindən verilən məlumatdan aydın olur ki, işğaldan sonra Laçın rayonunun ərazisində məhv edilən qiymətli nadir bitkilərdən biri də Hacısamlı meşəsində dünyada ən qiymətli bitki növü sayılan qırmızı palıd (qızıl palıd) ağaclarıdır. Qırmızı palıd Azərbaycanda yalnız Laçın rayonu ərazisində yerləşən Qaragöl Dövlət Təbiət Qoruğu və Dövlət Təbiət Yasaqlığı ərazisindəki Hacısamlı meşəsində yayılmışdı. İşğala qədər bu ərazilərdə qırmızı palıd 4000 hektardan artıq sahəni əhatə edirdi. Əvvəlcədən qeyd edim ki, adı

"Qırmızı kitab"a düşmüş, nəsli kəsilməkdə olan nadir endemik və relikt ağaclardan biri olan qırmızı palıd təbiətşünaslarımız tərəfindən olduqca az tədqiq edilmişdir.

Qədim zamanlardan palıd ağacı müqəddəs ağac hesab edilmişdir. Slavyanlar, romalılar və yunanlar bu ağacın möcüzəvi xüsusiyyətlərindən söz açır, ona sitayiş edir, miflər, əfsanələr və hekayələr yazırdılar. Bütpərəstlər palıd meşələrində müxtəlif mərasimlər, o cümlədən qurban bayramları təşkil edirdilər.

Əhəmiyyətli qərarların qəbulu üçün palıd ağaclarının kölgəsinə yığışardılar. Mövhumata əsasən əgər palıd ağacı kəsilərdisə, bədbəxt hadisələrin baş verməsi ehtimalı artardı.

Orta əsrlərdə hər bir şəhərin baş meydanında mütləq palıd ağacı əkilərdi. Bu qüdrətli ağacın altında vacib hadisələri elan etmək adət halını almışdır.

Azərbaycan xalqı palıd ağacına ta qədim dövrlərdən möhkəmlik, əyilməzlik, uzunömürlülük rəmzi kimi baxmışdır. 1000-1500 il və daha artıq ömür sürən palıd ağaclarının Azərbaycan Respublikasında 9 növü bitir ki, bunlardan biri də qırmızı palıd ağacıdır. Yadımdadır, 1970-ci illərin əvvəllərində yaşayış məntəqələrindən xeyli aralıda, çətin keçilən ərazilərdə hələ də ortasına örkəndolanmaz qırmızı palıd ağaclarına rast gəlmək olurdu.

Bu gün dünyada 500 ildən çox yaşı olan palıd ağacları tarixi abidə hesab edilir.

Fıstıqkimilər fəsiləsinin palıd cinsinə aid bitki növü olan qırmızı palıd (bəzi mənbələrdə qızılı palıd) ağacının hündürlüyü 25 m-ə qədər ola bilər. Gövdəsi nazik, hamar və boz qabıqla örtülüb, yaşlı ağaclarda qabıq çatlayır və rəngi tündləşir.

Nazik, incə, parlaq, diş-diş yarpaqlar dərin çıxıntılarla, uzunluğu 10-20 santimetrə, eni 8-15 santimetrə qədər olur. Yarpaqlar yazda yaşıl, payızda – sentyabrın sonu, oktyabrın əvvəlləri qırmızı, qonur və qəhvəyi rəng alır. Yumurtavari yarpaqlar 3-5 qanadlı olur. Yarpaqlama dövrü ilə birlikdə çiçəkləyir. Çiçəkləmə dövrü 10 günə qədər davam edir. Çiçəkləri yastı, dəyirmi, xırda sırğavari dəstələrdə birləşir.

Qırmızı palıd əsasən payızda məhsul verir. Məhsul verməyə 15 yaşdan sonra başlayır. Meyvələr şaraoxşar, qəhvəyi-qırmızı rəngli qozalardan ibarətdir. Bitki əsasən qozalarla çoxalır. Toxumluq palıd qozalarının əsas zərərvericiləri isə siçanlardır.

Əkin üçün yazda cücərmiş qozaları nəm torpağa basdırmaq daha yaxşıdır. Yaz əkini donvurma riskini tam istisna edir.

Qırmızı palıd ağacları torpağa az tələbkar bir bitkidir. Hacısamlı meşələrində bitən Qaya palıdından fərqli olaraq Qırmızı palıda adətən münbit, məhsuldar, nəm torpaqlı ərazilərdə rast gəlinir. Şaxələnən saçaqlı kök sistemi olan ağacın mil kökü çox dərinə gedir, yan köklər isə hər tərəfə eyni tərzdə şaxələnir. Qırmızı palıd Azərbaycandan başqa əsasən Şimali Amerikada 35-ci paraleldən başlayaraq şimala doğru, Kanadaya qədər ərazilərdə yayılmışdır. İşıqsevəndir, kölgəyə, küləyə, 40 dərəcəyədək istiyə, şaxtaya, xəstəliklərə və zərərvericilərə qarşı davamlıdır.

Dünyada ən qiymətli bitki növlərindən biri olan qırmızı palıd ağacından bir çox ölkələrdə xiyabanların, parkların və bağçaların dekorativ bəzədilməsi üçün istifadə edilir.

Relikt ağaclardan biri olan qırmızı palıd ağacının yaxşı cilalanan və zərbəyədavamlı içlik materialından gəmiqayırmada, qayıq istehsalında, neftmədən sənayesində, mebel istehsalında, tikintidə, müxtəlif növ üzlük, döşəmə materialları (əsasən də parket) və xüsusən konyak spirti saxlamaq üçün çəlləklər düzəldilməsində istifadə olunurdu. Yaxşı hamarlanır, amma çətinliklə emal edilir.

Keçmiş zamanlarda tərkibində çoxlu aşı maddələri olduğundan qırmızı palıd ağacının qabığından dəri-gön aşılanmasında, həmçinin boyaqçılıqda (əsasən də qəhvəyi rəng çalarlarının alınmasında) istifadə edilmişdir. Ondan rəng istehsalı üçün xidmət edən tanini alırlar. Dam və evlərin dam örtüyündə bu ağacın oduncağından hazırlanmış kirəmitlər isə evlərə özünəməxsus gözəllik verirdi. Bu cür damı olan evlərə Laçın rayonunun bir çox kəndlərində son dövrlərə qədər rast gəlinirdi. Bu ərazilərdə yerləşən yaşayış məntəqələri inkişaf etdikcə bu nadir ağaclardan sənayedə, tikintidə, kənd təsərrüfatı alətlərinin, ev əşyalarının hazırlanmasında, kömür istehsalında, odun tədarükündə istifadə edilməsi nəticəsində onların sayı azalmış və nəhayətdə adı "Qırmızı kitab"a düşmüşdür. Bütün bunlarla yanaşı təbii fəlakətlər zamanı, əsasən də ildırım vurmaya ən çox palıd ağaclarının məruz qalması üzündən ərazidə mövcud olan qırmızı palıd meşələrinə də ziyan dəyirdi. Vaxtı ilə (XVIII əsrin sonu, XIX əsrin əvvələrinə qədər) Hacısamlı meşələrində ağaclarının altına gün düşməyən, keçilməz meşə zolaqları əmələ gətirən bu nadir, relikt bitki olan qırmızı palıd ağaclarının gələcəyi bu gün təhlükə altındadır.

Sovxoz və kolxozların yaranmasından sonra meşələrin bir hissəsi onların tabeliyinə keçdi. Bundan sonra tövlələrin tikintisi və təmiri, həmçinin yaylağa köç edən sovxoz və kolxoz işçiləri, eləcə də kənd sakinləri alaçıq qurmaq

üçün bu ağacların cavan zoğlarından istifadə edirdi. Bulaq üstə yeyib-içməyə gedənlər bu ağacların nazik və düz budaqlarından şiş düzəldirdilər.

Tibbdə qırmızı palıdın qabıq və yarpaqlarından hazırlanmış cövhər və həlimlərdən homeopatik vasitə kimi istifadə olunur. Bu xammal sətəlcəmə qarşı yaxşı təsirə malik olmaqla bərabər büzücü xarakterlidir. İshal zamanı, ekzemalar, diş ətinin iltihabı, varikoz, qaraciyər və dalaq xəstəlikləri zamanı istifadə edilir. Ta qədim zamanlardan türkəçarə dərmanların hazırlanmasında istifadə edilmişdir.

Ağacın cavan budaqları və qabığından istifadə qan dövranını yaxşılaşdırır, orqanizmin ümumi əhvalını yaxşılaşdırır, immun sistemini artırır.

Trombozlar, uzunmüddətli qəbzlik zamanı, 12 yaşa qədər uşaqlar tərəfindən istifadəsi zərərlidir. Normadan artıq qəbul öymə və mədə-bağırsaq problemləri yarada bilər.

Ağacın yarpaq və qabığından dərmanların istehsalı üçün də tətbiq edilir. Yarpaqlar may ayının ortasında, yeni çıxmış cavan budaqlar və qabığı isə yaz aylarında, əsasən ağacın orqanizmindəki şirələrin artması dövründə toplanır. Xammal günəş şüalarından uzaq talvarın altında qurudulur. Yeni çıxmış cavan budaqlar dəstə-dəstə bağlanır və talvardan asılır. Düzgün saxlama vaxtı palıd qabığı 5 ilə qədər, yarpaqlar isə 1 ilə qədər öz müalicəvi xüsusiyyətlərini itirmir.

Avropada palıd qozaları qida məhsulları sırasına daxil edilmişdir. Bu fakt Azərbaycanda da özünü təsdiq edir. Anam Səmərqa Hümbətova Böyük Vətən müharibəsi illərindən söhbət düşəndə ilk öncə qırmızı palıdı xatırlayırdı. Onun söhbətlərindən aydın olurdu ki, həmin illərdə taxıl qıtlığı bütün dünyanı bürümüşdü. Çörək və yaxud un talonla verilirdi. Kənd qadınları (hətta nisbətən böyük yaşlı uşaqlar da) dəstə-dəstə vaxtaşırı Hacısamlı meşəsinin əlçatmaz yerlərinə yollanar, xəzəlin altında olan palıd qozalarını toplayardılar. Axşamçağı topladıqları palıd qozalardan şələ tutub kəndə dönərdilər.

Tədarük edilmiş palıd qozaları sacda qovrulur, qabığı təmizlənərdi. Daha sonra kirkirədə (həcmi çox olduqda dəyirmanda) üyüdülərdi. Bir az un əlavə edilməklə çörək bişirilərdi. Beləliklə də yaranmış çətinlikdən, aclıqdan yaxa qurtarardılar. Bu məqsədlə palıd qozaları ilə yanaşı armud qurusu (qax), boranı, şəkər çuğunduru və digər ərzaqlardan da istifadə edilirdi. Bundan əlavə qovrulmuş palıd qozası çörək əvəzi istifadə edilərək pendir və ya şor ilə birlikdə yeyilərdi.

Bu istiqamətdə araşdırmalardan aydın oldu ki, yazılı mənbələrə görə, ilk dəfə palıd ağacının qozalarından qədim Yunanıstanda istifadə edilməyə

başlamışdılar. Palıd qozası unundan müxtəlif növ çörəklər bişirildiyi bildirilirdi. Palıd ağacından yunanlar kotanların və odlu silahların düzəldilməsində istifadə edirdilər. Rusiyada isə tozağacı süpürgələrini tez-tez qırmızı palıd süpürgələri əvəz etmişdir.

Qırmızı palıd qozasının yetişmiş, çiy meyvələrinin dadı acıtəhərdir, amma qovrulduqdan sonra onlar dadlı və qidalı olur. Qozalar özündə zülal, piy, şəkər və nişasta saxlayır. Tərəvəzləri duza qoyan zaman ağacın yarpaqlarından istifadə edilirdi.

Palıd qozaları çöl və ev heyvanları üçün də qiymətli yemdir. Çöl heyvanlarından dələlər, əliklər, qabanlar, siçanlar, siçovullar və digər məməlilər bu qidadan istifadə edirlər. Ev heyvanları və quşları (hindquşu, qaz, ördək və s.) üçün də palıd qozası sevimli qida məhsullarından biridir.

Hələ keçmiş zamanlardan (yazılı mənbələrdə Roma imperiyası dövründən) yaxşı, nəfis şərab əldə etmək üçün minimum silkələnmə, müəyyənləşdirilmiş temperatur, rütubət və işıqlandırma, yaxşı hava verilməsi, zəruri mikromühitlə yanaşı uzun müddət saxlamaq üçün keyfiyyətli qab məsələsi də əsas idi. Bu növ qablardan biri və bəlkə də ən birincisi qırmızı palıddan hazırlanmış çəlləklər olmuşdur. Müxtəlif növ şərabların belə çəlləklərdə saxlanması bərk zərrəciklərin qabın dibinə çökməsinə şərait yaradır, qırmızı palıddan hazırlanmış çəlləklərdə saxlanılan əksər spirt və şərablar isə sadə içkini nəfis şəraba çevirməyə qadir xüsusi ətir verir. Bütün bunları nəzərə alan fransızlar nisbətən yeni istehsal edilmiş şərabları yalnız qırmızı palıddan hazırlanmış çəlləklərdə saxlamaqla məxsus səciyyəvi dadlarla zənginləşdirirdilər. Çəlləklərin hazırlanması üçün içlik xammal lazım idi. Lazım olan içlik xammalın yüksək keyfiyyətinin olması ilə yanaşı asan və ucuz başa gəlməsi də əsas şərtlərdən idi. Bu yolda axtarış aparan firənglər ilk öncə Fransadan çox da uzaqda olmayan Hacısamlı meşələrindən yararlanmağı qərarlaşdırırlar.

Sovet hökuməti dövründən əvvəlki zamanlarda hətta araba yolu belə olmadığı vaxtlarda hazır içlik oduncaqları Fransaya qəflə-qatırla daşımışdılar. Hacısamlı meşələrində bitən qırmızı palıd ağacının oduncağından istifadə etmək üçün XVIII əsrin sonu, XIX əsrin əvvələrində Şapon adlı fransız mülkədar və onun oğlunun iştirakı ilə atyeriməz yolları olan Qırxqız dağından keçməklə hal-hazırda Xocalı rayonunun inzibati ərazi vahidində yerləşən Badara kəndinə (Hacısamlı – Badara) araba yolu çəkilir. Ərikli kəndinin ərazisində, Arpa gədiyi adlı yerin arxasında Şapon tərəfindən

abadlaşdırılan, qırmızı palıddan hazırlanmış taxta nov salınmış bir bulaq el arasında "Şaponun bulağı" adlandırılırdı.

Şapon ağacları kəsdirdikdən sonra Qasımuşağı obasının ərazisində qərar tutan Şamkənd kəndinə daşıtdıraraq tədarük etdirmişdir. İçlik materiallar xüsusi kustar üsulla hazırlanırdı. Uzaq məsafələrdə olan oduncaqlar isə meşənin münasib sayılan müxtəlif yerlərində toplanaraq tədarük edilmiş və orada səliqə ilə üst-üstə yığılaraq hazırlanmışdır. Ancaq yolun çəkilişinin başa çatdığı dövr sovet hakimiyyətinin qurulduğu vaxta təsadüf etdiyi üçün meşələrdə hazırlanmış içlik oduncağın çox hissəsi daşınmamış qalır. Həmin içlik oduncaqlar uzun müddət, demək olar ki, 1970-ci illərin sonlarına qədər yaşayış məntəqələrindən xeyli uzaq ərazilərdə tədarük olunmuş şəkildə qalmaqda idi.

Əhalinin rifahının yüksəlməsinə xidmət edən "Firəng yolu" (Firəng sözü danışıq dilində "fransız" mənasında işlədilir) ilə əsasən qırmızı palıd daşınması nəzərdə tutulmuşdur. Lakin qırmızı palıdın daşınması planları ilə yanaşı fransızlar buradan istər yol çəkilməmişdən əvvəl, istərsə də yol çəkilişi zamanı gücləri yetən qədər bir çox yeraltı sərvətlərimizi də (civə, firuzə və s.) daşımaqla məşğul olmuşdular. Badarada cəmlənən içlik materiallar və digər yüklər isə Yelizavetpol quberniyasının Yevlax kəndinə (indiki Yevlax şəhərinə) göndərilirdi. Yevlaxdan isə Bakıya və digər şəhərlərə daşınardı. Daşınma əsasən kukuşkalarla yerinə yetirilirdi.

Bolşeviklərin qurduğu sovet hökuməti yenicə ayaq üstə duruş gətirməyə başlayırdı ki, gözlənilməz hadisə, üç siyasi sistemin – burjua-demokratik, sosializm və faşist-militarist sistemlərinin qarşı-qarşıya durduğu bir vaxtda gözlənilmədən, 1939-cu il sentyabrın 1-də İkinci Dünya müharibəsi başlandı.

Ölkədə fəaliyyət göstərən əmək müəssisələrinin fəaliyyəti, eləcə də ölkə iqtisadiyyatı münaqişənin ağır təsirinə məruz qaldığından vəziyyət tədricən çox pis bir hala düşmüşdür. Müharibə başa çatsa da, hələ də digər bölgələrdə olduğu kimi Hacısamlı nahiyəsində də ağır və acınacaqlı iqtisadi durum, həmçinin insanların həyat səviyyəsinin yüksəldilməsi məqsədilə Hacısamlı kəndində Böyük Vətən müharibəsindən sonra 1940-cı illərin sonu, 1950-ci illərin əvvəli Azərbaycan Taxta Emalı Sənayesi Laçın Meşə Təsərrüfatı İdarəsinin nəzdində Hacısamlı kəndində Taxta Emalı Zavodu, Nağdalı kəndində isə sovxozun nəzdində böyük Taxta Emalı Emalatxanaları quraşdırıldı və işə salındı. Bir sözlə, fransızların yarımçıq qalmış işini ruslar davam etdirməyə başladı.

Hacısamlı Taxta Emalı Zavodu Qasımuşağı obasının ərazisində quraşdırılan ilk rəsmi və həcmcə ən böyük Taxta Emalı Zavodu olmuşdur. Kənddə yaşayış olmadığından köhnə Hacısamlı kəndinin xarabalıqları yerində zavodda işləyən fəhlə və qulluqçular üçün yeni "Fin evləri" gətirildi və quraşdırıldı. Yaşayış məntəqəsində həyat yenidən canlandırıldı. Ruslar tərəfindən quraşdırılan bu zavodda xeyli işçi işlə təmin edildi.

Maşın və texnikanın işləyə bilmədiyi ərazilərdə olan qırmızı palıd ağaclarını şose yola qədər daşımaq üçün öküzlərdən istifadə edilirdi. Əziyyətlərə qatlaşan işçilər tərəfindən zirvələrə yaxın ərazilərdə olan ağaclar kəsilərək hazırlanır və aşağıya, şose yola daşınırdı. Bütün bunlar üçün Laçın Meşə Təsərrüfatı İdarəsi tərəfindən xeyli öküz bəslənirdi.

Hacısamlı Taxta Zavodu Qasımuşağı obasının kəndlərindən gələn yolların kəsişdiyi bir yerdə yerləşirdi və yuxarı kəndlərə şose yol çəkilmədiyi halda Hacısamlı kəndinə şose yol çəkilmişdir. Vaxt ötdükcə obanın ərazisində yeni şose yollar salınırdı. İstehsal olunan müxtəlif növ taxtalar, əsasən də çəlləklər üçün müxtəlif ölçülü hazır taxtalar buradan yük maşınları ilə başqa ölkələrə, eləcə də Azərbaycanın şəhər və kəndlərinə aparılırdı.

Bir müddət sonra Nağdalı kəndinin ərazisində də taxta emalı üçün kolxoz daxilində emalatxana işə düşdü. Nəticədə çox sayda insan işlə təmin olunsa da, əvəzində qırmızı palıd ağacları kütləvi şəkildə qırılmağa başlandı. Qeyd etmək lazımdır ki, bu emalatxana el arasında "pilarama" adlandırılırdı.

Nağdalı Taxta Emalı Emalatxanası Çilgəz çayının kənarında inşa edilmişdir. Bu Taxta Emalı Emalatxanası əvvəllər köhnə hissələrindən yığılmış parovozun verdiyi buxarın köməyi ilə işləyirdi. Daş kömür əvəzinə içlik materiala yaramayan oduncaqları odluq yerinə yığır, alınmış buxarla işləyən lokomotiv digər cihaz və alətləri idarə edirdi. Bu yerlərə elektrik xətləri çəkildikdən sonra elektriklə işləməyə başladı. Nağdalı Taxta Emalı Emalatxanasının təməli bu ərazilərdə işləməyə məcbur edilən ruslar tərəfindən qoyulmuşdur. Onlar vaxtı ilə bu ərazilərə sürgün edilmiş və bu ərazilərdə yaşamışdılar.

Hacısamlı Taxta Emalı Zavodu və emalatxananın işə salınmasından bir müddət sonra digər ağaclarla yanaşı uca qamətli, ortasına örkən dolanmaz qızıl qiymətinə bərabər olan qırmızı palıd ağacları cansız kötüyə çevrildi. Bütün bunların əvəzində isə bizim qızıl palıdın sorağı qısa vaxt ərzində keçmiş SSRİ-nin müxtəlif yerlərindən və bir çox digər xarici ölkələrdən gəlməyə başladı. Bir müddət sonra Hacısamlı meşələrində olan içlik materiallar tükənməyə başladı. Bu səbəbdən də Qasımuşağı obasının ərazisində taxta emalı dayandırıldı. Lakin yerli əhalinin tələbatını ödəmək məqsədi ilə Ha-

cısamlı Taxta Emalı Zavodu və emalatxana öz fəaliyyətini qismən də olsa 1992-ci ilin may ayına qədər davam etdirmişdir.

Ermənistan Respublikası Silahlı Qüvvələri həmin əraziləri işğal etdikdən sonra ermənilər Hacısamlı meşəsindən qırmızı palıdı qıraraq yenə də bu məqsəd üçün içlik materialı 1990-cı illərin əvvəllərindən etibarən Fransaya, İrana və digər ölkələrə satır, oduncağı isə yanacaq kimi yerli ermənilər tərəfindən istifadə olunur.

Ermənistandan və xaricdən axın edən ermənilər təkcə Hacısamlı meşələrindən deyil, işğal altında olan Laçın, Kəlbəcər, Qubadlı və digər bölgələrdən qiymətli ağac növlərini kütləvi şəkildə qıraraq yarımfabrikat şəklində xarici ölkələrə satırlar. Laçının işğalından sonra ermənilər onun olduqca qiymətli ağac növlərinin də yer aldığı zəngin meşə ehtiyatlarını kütləvi şəkildə talamağa başlayıblar. Vaxt ötdükcə rayon ərazisində bitən və dünyada ən qiymətli relikt palıd növü olan qırmızı palıd meşələri ermənilər tərəfindən qırılır və mebel istehsalı üçün qiymətli xammal kimi Ermənistana, oradan da Yaxın Şərq ölkələrinə və digər yerlərə satılır. Bir neçə il əvvəl Dağlıq Qarabağa səfər etmiş jurnalistlər Laçın rayonunda olan Piçənis, Şamkənd və Hacısamlı meşəliklərində dünya şöhrətli qırmızı palıdın ermənilər tərəfindən necə qırılıb daşındığını müşahidə etmişdilər. Bu meşəliklərdə qırmızı palıd 4 min hektardan çox ərazini əhatə edirdi, ermənilər neçə illərdir həmin meşələrdən qırmızı palıdı qıraraq şərab çəlləklərinin istehsalı üçün Fransaya satırlar. Bu üzdən nadir meşəlik tükənmək üzrədir. Habelə Laçın ərazisindən irigövdəli qoz ağaclarının kütləvi şəkildə qırılaraq mebel istehsalı üçün İrana satıldığı məlumdur.



Ata-babalarımızdan bizlərə yadigar qalan bu təbiət abidələrini qoruyub saxlaya bilmədik. İnanırıq ki, biz laçınlıların birliyi, zəhməti, ordumuzun güc və qüdrəti o torpaqları düşmən tapdağından azad edəcək.

**Sultan HÜMBƏTOV**

**AXTAR BABALARI**

# ATAMIN DAYISI QƏNBƏR HAQQINDA XATİRƏLƏRİ

Biz təbiəti, yeraltı və yerüstü sərvətləri, mədəniyyəti ilə çox zəngin, qədim tarixə malik, xalq qəhrəmanları dillər əzbəri olan, gözəllikləri ilə düşmənlərini mat qoyan azad, suveren, müstəqil Azərbaycan dövlətində yaşayırıq.

Bildiyimiz kimi, Azərbaycan Respublikası bu gözəllikləri güzgü kimi özündə əks etdirir. Gözəlliklərinə, torpağının qızıldan qiymətli olmasına görə torpaqlarımız əsrlər boyunca düşmənlərin tapdağına məruz qalmışdır. Azərbaycan xalqı maddi və mənəvi cəhətdən o qədər zəngindir ki, düşmənlərimizin gözü həmişə torpaqlarımızda olub.

Xalq qəhrəmanlarından əvəzolunmaz igidliklər göstərənlərdən biri də Zəngəzur mahalından olan Sultan bəydir. Sultan bəy göstərdiyi qəhrəmanlıqlarla yanaşı yüksək mənəvi keyfiyyətlərə də malik olmuşdur. Xalqının azadlığı uğrunda canından keçməyə hazır olmuşdur. Onun göstərdiyi qəhrəmanlıqlar tarixi bir salnamədir.

XX əsrin I yarısında xalqımıza qarşı erməni vəhşilikləri törədilirdi. Azərbaycanlıların çörəyini yeyib torpağında yaşayan ermənilər həmişə nankorluğu, namərdliyi, törətdikləri vəhşilikləri ilə seçiliblər.

Vətənimizin müxtəlif bölgələrində – İrəvan, Naxçıvan, Zəngəzur ərazilərində baş vermiş qırğınlarda azərbaycanlılar ermənilər tərəfindən işgəncələrə məruz qalmış, ağlagəlməyən vəhşiliklərlə qarşılaşmışlar. Ermənilər başqalarının əmrlərini yerinə yetirən, törətdikləri qırğınlarının sonu görünməyən, uşaqlara, qocalara, qadınlara rəhmi gəlməyən dərəcədə cılız görünən bir “millət”dir.

Ermənilərə qarşı mübarizədə xalqımızın igid, məğrur, yenilməz, qəhrəmanlığı ilə tarixə öz möhürünü vuranlardan biri olan Sultan bəy Sultanov bir çox qələbələr qazanmışdı. Mükəmməl hərbi biliyə yiyələnən Sultan bəy Zəngəzurda erməni-daşnak qoşunlarının məğlub olmasında taktikalardan böyük ustalıqla istifadə etmişdir. “Nalşəkilli mühasirə”, “Dağlarda tufan” və başqa taktikalardan istifadə etməklə xüsusi peşəkarlıq göstərmişdir. Sultan bəyin Zabux dərəsində ermənilər üzərindəki qələbəsi dillər əzbəri oldu. Bir günlük qanlı döyüşdə erməni Andranikin təxminən 5 minlik qoşunu məhv edildi.

Sultan bəyin oğlu kimi sevdiyi, böyütdüyü Qənbər haqqında eşitdiklərimi hamı ilə paylaşmaq istəyirəm. Qənbər haqqında məlumatları Mişni kənd sakini, Mişni kənd orta məktəbinin metodist, qabaqcıl müəllimlərindən biri olan Qarayev Ramazandan toplamışam. Qənbər onun dayısı olub.

Sultan bəy yüzbaşı Rüstəmə deyir ki, kəndlərin hamısını gəzirəm, özümə ləyaqətlə xidmət eləyən bir nəfər tapa bilmirəm. Çox götür-qoy etdim ki,

Zəngəzur üzrə Mişni kəndinin adamlarından etibarlı, dosta sədaqətli, özündən böyüklərə sədaqətlə xidmət edən bir adam tapım. Rüstəm, mənə çay, yemək verən, xəyanət bilməyən, sirr saxlamağı bacaran bir cavan oğlan uşağı lazımdır. Ümid edirəm ki, belə oğlan uşağı sizin Mişni kəndində vardır.

Yüzbaşı Rüstəm xeyli vaxt fikirləşdi və nəhayət, qərara gəldi ki, Sultan bəyə layiq bu cavan oğlan ancaq əsli-kökü düz, halal, dostluğa sədaqətli olan Cəfər kişinin oğlu Qənbər ola bilər. Bu söhbəti eşidən Sultan bəy yüzbaşı Rüstəmə dedi ki, həmin uşağın atası Cəfər kişini yanıma gətirin.

Cəfər kişi Sultan bəyin hüzuruna gəlir. Sultan bəy Cəfər kişiyə deyir ki, eşitmişəm sizin ailə dostluğa çox sədaqətlidir. Mən çox götür-qoy etdim ki, mənə layiq, həm boy-buxunda, həm qoçaqlıqda fərqlənən, dayaq olan bir gənc lazımdır. Belə bir gənc sizin oğlunuz Qənbərdir. Sultan bəyi dinləyən Qənbərin atası Cəfər kişi deyir ki, hörmətli bəy, mənim kənara veriləsi oğlum yoxdur. Anası Hürü ondan ayrı dura bilməz. Sultan bəy: "Cəfər kişi, yeddi oğlun var. Bu oğlanlarından biri mənimdir. Mən oğlun Qənbəri səndən də yaxşı saxlayacağam", – deyir. Cəfər kişi bu ab-havaya baxaraq razılaşır: "Oğlum sənə peşkəşdir".

Həmin gündən Abbasov Qənbər bəylə onun iqamətgahına gedir. Qısa müddətdə Sultan bəyin və ailəsinin öz etibarı ilə hörmətini qazanır. Sultan bəyin evinə gələn qonaqlara Qənbər lazım olan hörməti edir, onları razı yola salırdı.

Qənbər Ermənistan-Azərbaycan münaqişəsində (1918-1920) fəal iştirak etmiş və ermənilərə layiqli cavab vermişdir. Sultan bəy hara gedirdisə Qənbəri özü ilə aparırdı. Sultan bəy Qənbərə deyirmiş ki, sən doğrudan da Əlinin Qənbərisən.

Zəngəzurda Sovet hakimiyyəti qurulanda bəyləri öldürür, əmlakını müsadirə edirdilər. Sultan bəyin də nə qədər əmlakı vardısa, mal-qarası ilə birlikdə müsadirə etdilər. Qənbər çənəsindən, alnından yaralanan Sultan bəyi dağ yolu ilə aparıb Qırxqız dağında bir zağada bir həftə saxlayır. Sultan bəy bir az yaxşılaşanda gecə vaxtı bəyi ata mindirib Sarıbaba dağının yolu ilə Alganlı bəylərinin evinə gətirir. Orada bəyə qulluq edib onu tam müalicə edirlər. Bir müddətdən sonra Araz çayını keçərək İrana gedirlər. Deyilənə görə, İranın Qum şəhəri ətrafında yaşayır. Orada da Qənbər bəyə öz sədaqəti ilə xidmət edir.

Bir gün bəy möhkəm xəstələnir. Deyir ki, Allahın altında mənim Kürdhacının çay evində saldığım calaq almadan bir dənəsi indi mənim olaydı. Bunu eşidən Qənbər qorxmadan hazırlaşır, İran-Azərbaycan sərhədini gecə keçir. Araz çayından adlayır, gecə yola davam edir, gündüz isə gizlənir. Bu minvalla bir neçə günə alma bağına çatır. Almanı yığır və həmin yolla geri

qayıdır. Almanı gətirib Sultan bəyə verir. Bəy Qənbərə deyir ki, çox sağ ol, oğlum. Sənin gördüyün bu işi mənim öz oğlanlarım görə bilməzdi.

Beləliklə, onlar orada yaşayırlar, 1941-1945-ci illərdə sovet qoşunları İrana daxil olur. Sultan bəy sovet qoşunlarının orada olmasından ehtiyat edərək Türkiyəyə gedir. Ömrünün sonuna kimi Türkiyədə yaşayır.

Abbasov Qənbər isə İranda qalır. Sovet qoşunları içərisində Laçın rayonundan Bığlı Həşim, Daşdılı Xasay da var idi. Onlar orada Qənbəri tapıblar. Qənbər orada sovet qoşunlarına lazım olan köməklik edir. Hətta onların radiosunda daima Azərbaycanın əleyhinə çıxış edən bir nəfəri öldürür. Sonra müəyyən edirlər ki, həmin ölən adam ermənidir. Qənbər harada və hansı quruluşda yaşamasına baxmayaraq, hər yerdə öz doğma Vətənini müdafiə etmişdir.

Çox əfsuslar ki, bu qədər qoçaqlıq, vətənpərvərlik, igidlik, öz xalqının namus və qeyrətini qoruyub saxlayan belə bir adamın sonrakı taleyindən xəbərimiz yoxdur.

Sultan bəylə Qənbərin İrana getməsindən sonra onun ailəsini gözümçıxdıya salmışdılar. Hələ püxtələşməmiş hüquq orqanları yerli, savadsız adamların satqınlıqla dediyi sözlərə inanaraq yersiz, heç bir hüquqa əsaslanmadan bəylərlə əlaqəsi olan adamların başına min bir oyun açırdılar. Belə ailələrdən biri də Abbasov Qənbərin ailəsi idi. Yerli satqınlar hüquq işçilərinə deyirdilər ki, Qənbər bu gecə evlərinə gəlmişdir. Həmin işçilər Qənbərin yaşadığı evə (dam və kahaya) gəlib yoxlama aparırdılar. Onlar Qənbərin anası Hürü arvada deyirdilər ki, Qənbərin gətirdiyi qızılın yerini de. Hürü arvad and içirdi ki, bizim evə bir dənə də olsun qızıl gəlməyib. Hüquq işçiləri bu deyilən sözə inanmayib əllərinə şişi alıb bütün evin içini deşik-deşik edirdilər ki, bəlkə qızılı tapalar. Nə qədər axtardılarsa, olmayan qızılı haradan tapa bilərdilər.

Qənbərin Sultan bəylə İrana getməsi Cəfər kişinin ailəsini çox çıxılmaz vəziyyətdə qoyub. Bütün edilən bu qəddarlıq Qənbəri və ailəsini düz yoldan yayındıra bilməyib. Qənbər İranda olanda sovet kəşfiyyatından ona deyiblər ki, sən Sultan bəyi öldür, biz sənin üçün lazım olan şəraiti yaradaq və səni ata yurduna aparaq. Qənbər onlara cavab verib ki, mən atamın və anamın mənə etdikləri qayğıdan çox Sultan bəydən qayğı görmüşəm. Sultan bəy mənim mənəvi atam hesab olunur. Mən heç vaxt bu qədər yaxşılığın əvəzində Sultan bəyə pislik edə bilmərəm. Əgər mən Sultan bəyə pislik etsəm onun mənə etdiyi yaxşılıq burnumdan gələr. Ailəmin Sovet hökuməti tərəfindən incidilməsi, onların başlarına müxtəlif oyunların gətirilməsi məni narahat etmir. Çünki ən pis iş öz ağasına xəyanət etməkdir. Mən də bunu ağlıma gətirə bilməzdim.

Qənbərin qohumlarının hamısı dünyasını dəyişdiyi zaman Qənbər sarıdan o dünyaya nisgilli getdilər. İndi Qənbərin bacısı və qardaşı nəvələri

yenə də Qənbərin İranda olan nəvələrini axtarır. Əgər belə bir axtarış müsbət nəticələnsə özümüzü dünyanın ən xoşbəxt adamı hesab edərik.

Qənbərin bacısı Sayad arvad ömrünün sonuna qədər öz qardaşının əl dəsmalını, baş darağını özündə yadigar saxlayırdı. Qənbərin qardaş və bacıları içərisində ən çox ona yanan bacısı Sayad arvad idi. Həmişə deyərdi ki, mən öləndə Qənbərin nişanəsini mənim üzümün altda qoyarsınız. Bir yerdə yaşadığı oğlu Misir müəllimə vəsiyyət eləmişdi ki, Qənbərin və uşaqlarının tapılması haqqında məlumatınız olarsa, gəlin qəbrimin üstə, deyin ki, Qənbərdən və uşaqlarından məlumat alınıb. Bəlkə ondan sonra mənim ruhum sakit ola. Qardaşımın dərdin çəkirdim, amma məni ayrı dərd də gözləyirmiş. 1988-ci ildən sonra Ermənistan-Azərbaycan münaqişəsi başlandı. Gündən-günə ölkədə bəd xəbərlər yayılırdı. 1988-dən 1992-ci ilin may ayının 18-ə qədər çox səksəkəli, qorxulu həyat keçirdik. 1992-ci il mayın 18-də ermənilər Laçın rayonunu işğal etdilər. Bizim məcburi qaçqın həyatımız başladı. Dərd üstündən dərd bizi yaxaladı. Həmin vaxtdan Qaradağ rayonunun Sahil qəsəbəsində məskunlaşdıq. Öz-özümə fikirləşirdim ki, İrana bir qədər də yaxınlaşmışıq. Qardaşım və qardaşım uşaqlarından xəbər tuta bilərəm. Mən elə fikirləşirdim ki, dünyada ən ağır dərd qardaş dərdidir. Məcburi köçkün olandan sonra hiss etdim ki, qardaş dərdindən betər vətən dərdidir. Allah-taala heç kəsi Vətənsiz, yurdsuz eləməsin. Mən can verəndə yadıma düşməsə də yadıma düşən qərib yerdə olan qardaşım Qənbər və doğulduğum, böyüdüyüm, ailə qurduğum ana vətənim Laçın rayonunun Mişni kəndi idi. Allah heç kəsi vətənsiz etməsin.

Sayad arvadın uşaqları, nəvələri, nəticələri Bakı şəhərinin Qaradağ rayonunun Sahil qəsəbəsində məskunlaşmışlar. Arzuları Prezidentimizin köməyi ilə yaxın zamanlarda öz dədə-baba yurdlarına qayıtmaqdır. Bu həm Qənbərin, həm də Vətəndə yurdsuz olan Sayad arvadın arzusudur.

Mənə belə gəlir ki, şərəfli bir ömür yaşamaq, xalqının mənafeyini düşünən insanlar müqəddəs insanlardır. İnanırıq ki, onun haqqında gec də olsa xəbər alacağıq.



Biz yüz faiz əminik ki, prezidentimiz İlham Əliyev bu çətin və şərəfli işin öhdəsindən müvəffəqiyyətlə gələcək. Torpaqlarımız mənfur düşmənlərin tapdağından azad olacaq.

**Sayad QARAYEVA,**
***Mişni kənd sakini, Laçın rayon***
***7 №-li tam orta məktəbin ibtidai sinif müəllimi***

**POEZİYA**

**Osman ALIYEV**



## LAÇINIMDAN YOXDUR, QARDAŞ

Bizim doğma elimizdə
Gözəl məkan çoxdu, qardaş.
Qarış-qarış hey gəzdikcə
Həsrət məni sıxdı, qardaş,
Laçınımdan yoxdu, qardaş!

Qəbələdə selə düşdüm,
Pirquluda gülə düşdüm.
Duman gəldi – tülə düşdüm,
Göz yaşlarım axdı, qardaş,
Laçınımdan yoxdu, qardaş!

Bulaqların yoxdu dadı,
Gördüyümə inanmadım.
Özüm-özümü aldadıb
Guya Kirsə qalxdım, qardaş,
Laçınımdan yoxdu, qardaş.

Salamladım şah Qazaxı,
Goranboyu, Oğuz, Qaxı.
Qonaq saxladı Şamaxı,
Hey kövrəlib baxdım, qardaş,
Laçınımdan yoxdu, qardaş.

O dağlarsız güləmmirəm,
Heç özümə gələmmirəm.
Özgə yerdə öləmmirəm,
Zəliləm nə vaxtdı, qardaş,
Laçınımdan yoxdu, qardaş!

Osman külli-var istəyir,
Bir doyumluq qar istəyir.
Bir məzarlıq gor istəyir,
Dediklərim haxdı, qardaş,
Laçınımdan yoxdu, qardaş!

***17 may 2013***

## MAYISDA

Duman gəlir, şeh tökülür, gün çıxır,
Yal-yamaclar gülə dönür Mayısda.
Ötən günlər için-için göynədir,
Göz yaşımdı, selə dönür Mayısda.

Gorsun düzü, Əlibulağı, Dik yoxuş...
Ləzzətini Əhlimandan gəl soruş.
Əl çatmayan qayalarda qaraquş,
Qartallar da xala dönür Mayısda.

Kərtin dalı Ağaxanı soruşur,
Qasımtolan Batıqlarla yarışır.
Buz bulaqlar Həkəriyə qarışır,
Bir həsrətli qola dönür Mayısda.

Əli dayıdı için-için ağlayan,
Olmuşları bir yadigar saxlayan.
Gözəllikdən dil-dil ötüb çağlayan
Qəm-qüssədən lala dönür Mayısda.

Həsrətimi o dağlara yay, haray,
Hanı Mürşüd, Surxay hanı, ay haray?
Teymur vardı... məclislərdə hay-haray –
Xatirələr bala dönür Mayısda.

Osman sisdə, xəyallarda yol azdı,
Quzey yolu sırsıradı, bəyazdı.
Sağ tərəfdə Sonasardı, Hoçazdı,
Mişnililər sola dönür Mayısdan.

**POEZİYA**

**Yadigar HƏŞİMOV**



## DAĞLARIN

Hicran yükü daha əyib qəddimi,
Kömək etmir ha çağırram cəddimi.
Gələn günlər bir-birindən bəddimi? –
Açılmır üzümə yolu dağların.

Biz vətənə həsrət, vətən bizlərə,
Lənət yurd satqını qeyrətsizlərə.
Düşmüşük şoranlı çölə, düzlərə,
Boş qalıbdı sağı-solu dağların.

Açmaz sinəsində bizsiz gül-çiçək,
Çaxmaz zirvəsində ildırım, şimşək.
Həsrətdən saralıb yəqin mənimtək,
Solub hər ağacı, kolu dağların.

Pozulub növrağı, gör nə haldadı,
Çünki hər sakini bir mahaldadı.
Bizi haraylayır, gözü yoldadı,
Uzalı qalıbdı qolu dağların.

Ay Yadigar, qara günlər ötüşər,
Yaraların qaysaq tutar, bitişər.
Həsrət ötər, gələr o gün, yetişər,
Gedərik seyrinə ulu dağların.

## BİLMİRƏM

Ən ağır dərdləri çəkib dözərdim,
Vətən həsrətinə dözə bilmirəm.
Mənə "dözümlü ol" deyən dostlarım,
Axı mən nə deyim sizə, bilmirəm.

Ürəyimdə neçə düyün, dağım var,
Daş əridən bayatım var, ağım var.
Torpağımda at oynadan yağım var,
Fələk qarğıyıbmı bizə, bilmirəm.

Gəzib bərəsində kəklik atardım,
Məxmər çəmənlərdə şehə batardım.
Dərib güllərindən dəstə tutardım,
İndi bir çiçəyin üzə bilmirəm.

Ay Yadigar, borandasan, qardasan,
Nə vaxtdır amansız intizardasan.
Gecə-gündüz xəyallarla ordasan,
Demə yolum düşmür, gəzə bilmirəm.

## QƏLBİMƏ SARI

Axtardığım çiçəyimsən, gülümsən,
Əzab vermə aşiqinə, gülüm, sən.
İnsaf eylə, bircə dəfə gülümsə,
Axsın sevinc seli qəlbimə sarı.

Ara, düzünü seç həyat yolların,
Olma aludəsi varın, dolların.
Gəl, ay gülüm, xoşbəxtliyin qolların
Aç bu yaralanmış qəlbimə sarı.

Eşqin dəryasında üzən, ay sona,
İnanmasan mənə, istəsən sına.
Qıyma bu könlümün güzgüsü sına,
Gəl qoyma dağıla qəlbim hasarı.

**POEZİYA**

## Elbrus ABBASOV



Abbasov Elbrus Xaspolad oğlu 1946-cı il may ayının 16-da Laçın rayonunun Daşlı kəndində anadan olub. 1968-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) baytarlıq fakültəsini bitirib. 1976-cı llədək rayonun Kürdhacı, Cağazur və Şəlvə baytar məntəqəsinin müdiri, sonralar Daşlı kənd icraiyyə komitəsinin sədri, Jdanov adına sovxozun direktoru, Nəsimi adına kolxozun sədri olmuşdur.

1999-cu ildən 2009-cu ilədək Ağsu rayonunun Gürcüvan kənd bələdiyyəsinin sədri vəzifəsində işləmişdir. Hal-hazırda təqaüdçüdür.

Şeir yazmağa orta məktəb illərində başlasa da, yazdıqlarını çap etdirməmiş, onları ən yaxın dostlara oxumaqla kifayətlənmişdir.

Son illər şeirləri respublika mətbuatında çap olunur və 2006-cı ildə "Xəyalım yön alıb yenə Laçına" adlı şeirlər kitabı işıq üzü görmüşdür.

1992-ci ilin mayından yurd həsrəti ilə yaşayan, taleyin ağır zərbəsi qarşısında Vətənində vətənsiz qalmış Elbrus Abbasovun şeirlərini oxuduqca elə bil ki, Xankəndinin, Xocalının, Xocavəndin, Şuşanın, Laçının, Ağdamın, Kəlbəcərin, Cəbrayılın, Füzulinin, Zəngilanın, Qubadlının səsini, harayını eşidirsən.

Arzusu ömrünün qalan hissəsini respublikanın 58 rayonuna səpələnmiş el-obası ilə birlikdə Laçın rayonunda, Şəlvə dərəsində, doğma Daşlı kəndində yaşamaqdır.

### ŞÜKÜR

Tanrı hələ nə yazıbdır bilmirəm,
İndiyədək verdiyinə çox şükür.
Övlad, nəvə yaraşıqdır məhləmə,
Belə ömür sürdüyünə çox şükür.

Böyük kimdir, kiçik kimdir sayılır,
Qocaya, cavana hörmət qoyulur.
Keçmişlərin ab-havası duyulur,
Sonu belə gəldiyinə çox şükür.

Razıyam mən oğuldan da, qızdan da,
Ömürdəki bahardan da, yazdan da.
Allahın verdiyi çoxdan, azdan da,
O, məsləhət bildiyinə çox şükür.

Nəvələr məlhəmdi olan dərdimə,
Qəddim əyilməyib hələ heç kimə.
Tanrı hər vaxt xoş baxıbdı üzümə,
Taleyimə güldüyünə çox şükür.

Qardaş payı, bacı payı, qız payı,
Həyatıma gəlməyiblər havayı.
Xoşbəxt hanı Elbrusdan savayı,
Allah, sənin verdiyinə çox şükür,
çox şükür!

## SƏNSİZ QALIB, MƏNSİZ QALIB LAÇINIM

Söhbət salıb ürəyimi dağlama,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.
Ah-vay edib yazıq-yazıq ağlama,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Dədələrin hikməti var sözümdə,
Səhər mehi dodağımda, üzümdə.
Bal süzülən bulaqları gözümdə,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Ağanusun "Turş suyu"ndan içən kim,
Qızılcadan sürüsünü çəkən kim?
Zabuxçayda bağ-bostanı əkən kim?-
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Kimə qalıb Malıbəyin bağları,
Cağazurun gül-çiçəkli çağları.
O Minkəndin baldırğanlı dağları,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Haray saldım "İşıqlı"dan "Arxud"a,
"Çalbayır"ı çox görürəm yuxuda.
Bağlı qalmış yolları aç, ay Xuda,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Şəlvədərə, Qorçudərə, Şamkənd də
Namərd əllə düşübdülər kəməndə.
Görən qayıdarıq biz Güləbirdə?-
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

"Bülündüzün yarması"ndan keçmişəm,
Pircahanda nahar üçün düşmüşəm.
Vağazinin bulağından içmişəm,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Hacıxanlı mehman üçün yaranmış,
"Turşsu yolu"n bilirəm ki, qar almış.
Göy yaylaqlar mənsizləşib saralmış,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Qədrini bil pərən düşmüş ellərin,
De minnətin görməmişik kimlərin?
Qayıdaydı o Laçınlı günlərin,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Qəriblikdə yaşamaqdan bezmişəm,
Çeşmə deyib, dağlar deyib gəzmişəm.
El-obamdan ayrılığa dözmüşəm,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Dinlə qardaş, güman qalıb özümə,
Getməliyik, qüvvət gəlsin dizimə.
Duman basıb, "Qırxqız" dəymir gözümə
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

Misri qılınc öz qınından çıxmalı,
Yağıların ürəyinə soxmalı.
Al bayrağı Laçınıma taxmalı,
Sənsiz qalıb, mənsiz qalıb Laçınım.

***15.11.2012***

## BAX BU DÜNYA GƏLDİ-GEDƏR DÜNYADIR

***(Gəncliyimizdə dostluq etdiyimiz, sonradan vəzifə sahibi olanda münasibətini dəyişən "dostum"a)***

Etdiyini başa qaxma, a dostum,
Qocaldıqca səhv buraxma, a dostum.
Dağ selitək çılğın axma, a dostum.
Bax bu dünya gəldi-gedər dünyadır.

Vəzifən var, salam verən çox olar,
Pay gəldikcə qarın şişər, tox olar.
Dərdin-qəmin müvəqqəti yox olar,
Bax bu dünya gəldi-gedər dünyadır.

Unutma ki, dövran dönər tərsinə,
Dostlar qaçar, düşmən dolar qəsdinə.
Sən düşərsən, əğyar minər kürsünə,
Bax bu dünya gəldi-gedər dünyadır.

Keçmişə dön, olanları unutma,
Cavanlıqda qalanları unutma.
Səni doğma sananları unutma,
Bax bu dünya gəldi-gedər dünyadır.

Yaxşılıq et qohuma da, yada da,
Yaxşılıqdır yalnız qalan dünyada.
Ad-san gətir nəcabətə, soyada,
Bax bu dünya gəldi-gedər dünyadır.

Neçələri altun yığıb, ləl yığıb,
Torpaq altda küplər üstə sal yığıb.
Neçələri milyon-milyon pul yığıb,
Bax bu dünya gəldi-gedər dünyadır.

Qismət olmur hər insana yığdığı,
Nur gətirmir hər buluddan yağdığı.
Ad-san almır hər ananın doğduğu,
Bax bu dünya gəldi-gedər dünyadır.

Çox görmüşəm sənin kimi gedəni,
Qayıdan baş acı fəryad edəni.
Başın yolan, üzün-gözün didəni,
Bax bu dünya gəldi-gedər dünyadır.

Vaxtı çatar el gözündən düşərsən,
Qaynatdığın qazanında bişərsən.
Bir gün gələr bu dünyadan köçərsən,
Bax bu dünya gəldi-gedər dünyadır.

Elbrusam, can deyənə can dedim,
Əhvalıma yananlara yan dedim.
Yol bilməzə, dil bilməzə qan dedim,
Bax bu dünya gəldi-gedər dünyadır.

***Bakı, sentyabr, 2014***

## EHTİRAM

***(Elimizin fəxri, istəkli əmioğlu Ehtiram Hüseynova)***

Səsində məlahət, üzündə nur var,
Yerişdə, duruşda dağtək qürur var.
Kökündən, soyundan keçib o vüqar,
Sənlə fəxr edirəm hər an, Ehtiram!

Bəmin xatırladır dağ şəlaləsin,
Zilin qartal qıyın, ildırım səsin.
Duydum nəfəsindən vətən həsrətin,
Sənlə fəxr edirəm hər an, Ehtiram!

Çıxdın ustadların imtahanından,
Xeyir-dua aldın ulu xalqından.
Görüm yarıyasan dostdan, yarından,
Sənlə fəxr edirəm hər an, Ehtiram!

Laçında məclis qur, Laçında oxu,
Qohumun, övladın subaydır çoxu.
Kaş ki çin çıxaydı gördüyüm yuxu,
Sənlə fəxr edirəm hər an, Ehtiram!

Əmin Elbrusu axtar Ağsuda,
Süfrəsi açıqdır qohuma, yada.
Gəlsən sevinərəm qərib diyarda,
Sənlə fəxr edirəm hər an, Ehtiram!

***Ağsu rayonu, Gürcüvan kəndi,***
***15.02.2008***

**POEZİYA**

**Ceyran QURBANOVA**



## UCA İNSAN
*(Anama)*

Nə vaxtdı qulağım həsrət səsinə,
Hardasan ürəyim, nəfəsim, ana.
Bilmirdim mənimçün belə əzizsən,
Mənim şirin dilim, bal səsim ana.

Ana, qurban olum sənin adına,
Yerini kim verər, söylə, ana, kim?
Səninlə çatmışam ucalıqlara,
Anasız kim çatıb şöhrət-şana, kim?

Nazımı çəkənim yoxdu, anacan,
Həsrətəm ilahi baxışlarına.
“Can, bala!” – deyənim yoxdu, anacan,
Gücüm də çatmayır göz yaşlarıma.

Səndən uzaqlarda qərib kimiyəm,
Sanki yetim kimi qalmışam, ana.
Yaman kövrək olub, yaz fəslindəki
Bəyaz bulud kimi dolmuşam, ana.

Elə darıxıram, elə, əzizim,
Səsinə, oduna, ocağına mən.
Təzə dil açanda olduğu kimi,
Ay ana, atılam qucağına mən!

## MƏNİM

Həyat yollarının qatarıyam mən,
Dağların ən qatı dumanıyam mən.
Sevginin alovlu ocağıyam mən,
Bilinməz nə dərdim, nə ahım mənim.

Çaylar kimi coşar, hərdən də susar,
Ərköyün uşaqtək inciyər, küsər.
Hərdən şimşək olub doğrayar, kəsər,
Hərdən bir xoş sözdü pənahım mənim.

Qəlbim gah sevincdi, gah da hədərdi,
Sevən ürəklərin daha nə dərdi?
Bugünkü həyatım gövhərdi, zərdi,
Hansı rəngdə olar sabahım mənim?

**POEZİYA**



**Rəvan HƏSƏNƏLİYEV,**
***Goranboy rayonu, Səfikürd kənd tam orta məktəbinin XI sinif şagirdi***

## ARAZA XİTABƏN

Ağlama Təbrizim, ağlama dayan,
Səni bizdən almış bu fani dövran.
Hər gün dava-şiddət, hər gün bir tufan,
Qalmış küləklərlə yalqız çəmənim,
Arazdan o yanda dərdim var mənim.

Nə vaxt qovuşarıq haradan bilim?!
Türk üçün darıxmış o Ərdəbilim.
Araz göz yaşımdır, mən necə silim?
Başımdan əskilmir dumanım-çənim,
Arazdan o yanda dərdim var mənim...

Bakı dərdi çəkdi baba Şəhriyar,
Başında dolandı min cürə ruzgar.
Təbriz həsrətiylə gəlməyir bahar,
Ayrı düşdü, iki oldu Vətənim,
Arazdan o yanda dərdim var mənim.

Cahana sığmayan qüdrəti vardır,
Qışı da yazıtək bir ilk bahardır.
Hər övladı igid qəhrəmanlardır,
Necoldu Səttərxan, hanı ərənim,
Arazdan o yanda dərdim var mənim.

Bir gün bitəcəkmi bu acı həsrət?!
Tükənməz Təbrizə o saf məhəbbət.
Bilirəm bitəcək qəm ilə zillət,
Rəvanam, aldatmaz məni bu zənnim,
Arazdan o yanda dərdim var mənim.

## DAĞLARIN DƏRDİ...

Elə zənn etmə ki, daşlar cansızdı,
Onların danışan tarix dili var.
Elə zənn etmə ki, dağ amansızdı,
Onun da ağlayan günü, ili var.

İndi vətən dərdi, dağların dərdi,
Bu dərd də ürəkdə acı kədərdi.
Yağı "Laçın" adlı bir gülü dərdi,
De, indi Murovun hansı gülü var?!

Daha al qırmızı Kəlbəcərdə su,
Ağladır Murovu vətən duyğusu.
Acı dəhşətdi bu, iztirabdı bu,
O tayda dərd çəkən igid eli var...

Kim qurtarsa yurdu odur qəhrəman,
Dünyada düşmənə bil yoxdur aman.
Görməsə də heç vaxt o tayı Rəvan,
Qarabağı sevib yazan əli var.

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




**"Bəxtiyar-4"** mətbəəsinin direktoru: **Bəxtiyar İSMAYILOV**
Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Elnur İRƏVANLI**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **01.10.2014**
Çapa imzalanmışdır: **26.12.2014**
Şərti çap vərəqi: **6.** Sifariş **№15**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **500.** Qiyməti: **2 AZN**

Dərgi **"Bəxtiyar-4"** istehsal-kommersiya firmasında
hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** baxtiyar54@rambler.ru
**Tel:** (+99412) 568-44-53, (+99450) 570-63-54
**Ünvan:** Bakı, Mir Cəlal 83